**Əli Abdullah**

# İslamda yemək-içmək və heyvan kəsimi

---

***Şəri məsələlər ayə və hədislərlə***

---

***Ey insanlar! Yer üzündəki qidaların təmiz, halal olanlarını yeyin, Şeytanın izi ilə getməyin! Həqiqətən, o (Şeytan) sizinlə açıq-açığına düşməndir. (Quran 2/168)***

بِسْمِ اللّٰهِ الرَّحْمٰنِ الرَّحِيْمِ

اِلٰهِیْ عَظُمَ الْبَلَآءُ وَبَرِحَ الْخَفَآءُ وَانْكَشَفَ
الْغِطَآءُ وَانْقَطَعَ الرَّجَآءُ وَضَاقَتِ الْاَرْضُ وَمُنِعَتِ
السَّمَآءُ وَاَنْتَ الْمُسْتَعَانُ وَاِلَيْكَ الْمُشْتَكٰى وَعَلَيْكَ
الْمُعَوَّلُ فِی الشِّدَّةِ وَالرَّخَآءِ اَللّٰهُمَّ صَلِّ عَلٰى مُحَمَّدٍ
وَّاٰلِ مُحَمَّدٍ اُولِی الْاَمْرِ الَّذِيْنَ فَرَضْتَ عَلَيْنَا طَاعَتَهُمْ
وَعَرَّفْتَنَا بِذٰلِكَ مَنْزِلَتَهُمْ فَفَرِّجْ عَنَّا بِحَقِّهِمْ فَرَجًا
عَاجِلًا قَرِيْبًا كَلَمْحِ الْبَصَرِ اَوْ هُوَ اَقْرَبُ يَا مُحَمَّدُ
يَا عَلِیُّ يَا عَلِیُّ يَا مُحَمَّدُ اِكْفِيَانِیْ فَاِنَّكُمَا كَافِيَانِ وَانْصُرَانِ
فَاِنَّكُمَا نَاصِرَانِ يَا مَوْلَانَا يَا صَاحِبَ الزَّمَانِ الْغَوْثَ الْغَوْثَ اَدْرِكْنِیْ
اَدْرِكْنِیْ السَّاعَةَ السَّاعَةَ الْعَجَلَ الْعَجَلَ يَا اَرْحَمَ
الرَّاحِمِيْنَ بِحَقِّ مُحَمَّدٍ وَّاٰلِهِ الطَّاهِرِيْنَ ط

## *ÖN SÖZ*

***Rəhman və Rəhim olan Allahın adı ilə. Həmd və səna aləmlərin Rəbbinə məxsusdur. Allahın rəhmət və bərəkəti peyğəmbərlər ağası Həzrət Muhəmmədə (s) və onun hər cür çirkinlikdən paklanmış Əhli-beytinə (ə) olsun.***

*Həqiqi səadətə qovuşmağın yalnız bir yolu vardır. O yolun adı təqvadır. Qurani-Kərimin buyurduğuna əsasən, nicat tapıb səadətə qovuşanlar təqvalı olanlardır.* [1] *Məsumlardan (ə) nəql olunmuş hədislərdə qeyd olunur ki, haramlardan çəkinən və vaciblərə riayət edənlər təqvalılardır. Ona görə də əgər səadətə qovuşub, nicat tapmaq istəyiriksə, təqva yolunu seçib haram-halallara diqqət yetirməli və bu barədəki göstərişlərə əməl etməliyik. Bu səbəbdən də hər bir şəxsə vacibdir ki, hər gün qarşılaşdığı haram-halal məsələlərini öyrənsin və əməl etsin. Bu məsələlərdən biri də yemək və içməyə aid olan hökmlərdir.*

*Haram qida qəbul etməyin insan üçün çox ciddi və mənfi təsirləri vardır. Onlardan bəziləri aşağıdakılardır:*

*1. Haram yeyən şəxsin namazı və digər ibadətləri qəbul olunmaz. Allah Rəsulu (s) buyurur:*

---

[1] «Bəqərə», ayə 1-5

من أكل لقمة من حرام لم تقبل له صلاة أربعين ليلة

***«Kim haram bir tikə yesə, onun namazı qırx gecə qəbul olunmaz.»*** [1]

*Başqa bir hədisdə Peyğəmbər (s) buyurur:*

العبادة مع أكل الحرام كالبناء على الماء

***«Haram yeməklə edilən ibadət su üzərində bina tikmək kimidir.»*** [2]

*2. Göylərdəki və yerdəki mələklər haram qida qəbul edən şəxsə lənət oxuyar. Həzrət Muhəmməd (s) buyurur:*

إذا وقعت اللقمة من حرام في جوف العبد لعنه كل ملك في السماوات والأرض

***«Bəndənin qarnına haram bir tikə düşdükdə, göylərdə və yerdə olan bütün mələklər onu lənətləyərlər.»*** [3]

*3. Haram yemək cənnətə girməyə mane olar. İslam Peyğəmbəri (s) buyurur:*

إن الله عز وجل حرم الجنة جسدا غذي بحرام

---

[1] «Mizanul-hikmət» cild 1, səh.597

[2] «Mizanul-hikmət» cild 1, səh.597

[3] Həmin mənbə

***«Həqiqətən, Allah Təala haramla qidalanmış bədənə cənnəti haram etmişdir.»***[1]

*Qeyd etdiklərimizdən açıq-aydın başa düşülür ki, gündəlik yeyib-içdiyimiz şeylərin haram-halallığına diqqət yetirmək nə qədər mühüm və vacibdir. Məsələnin dünya və axirətimiz üçün bu qədər əhəmiyyətli olmasına baxmayaraq mömin bacı və qardaşlarımızın ixtiyarında bu mövzuda Azərbaycan dilində geniş və ətraflı bir vəsaitin olmaması təəssüfləndirici və narahatedici bir haldır. Lakin şükürlər olsun ki, savadlı tələbələrimizdən olan Hacı Əli Allahın lütfü sayəsində bu mövzuda gözəl bir kitab tərtib edərək həmin boşluğu aradan qaldırmağa çalışmışdır. Bu xidmətinə görə Allah-təala qiyamət günündə onu Həzrət Əba Əbdillahil-Hüseynin (ə) şəfaətinə layiq etsin. Amin!*

***Höccətül-İslam vəl-müslimin Hacı Hüseyn Əlizadə***
***9 May 2012 m.***
***17 Cəmadiul-axər 1433 h. q.***

[1] Həmin mənbə

## Müəllifin müqəddiməsi

Allah-təala aləmdə müşahidə etdiyimiz bütün varlıqları insan üçün, insanı isə özünə ibadət etmək və Onu tanımaq üçün yaratmışdır. Allah-təala Qurani-kərimdə buna işarə edərək buyurur:

وَمَا خَلَقْتُ الْجِنَّ وَالْإِنسَ إِلَّا لِيَعْبُدُونِ

**"Cin və insanları yalnız Mənə ibadət etmələri üçün yaratmışam."**[1]

İnsan məhz Ona ibadət edib Onu tanımaqla həqiqi səadətə qovuşub nicat tapa bilər. Allah-təala bəşəriyyətə Onu tanıyıb Ona ibadət etmələri üçün müəyyən bir yol qərar vermişdir. Həmin bu yolu din olaraq müxtəlif peyğəmbərlərin vasitəsi ilə insanlara çatdırmışdır. Ən son olaraq isə Allah-təala həzrət Muhəmmədin (s) vasitəsi ilə İslam dinini nazil etmişdir. İslam dini özündən əvvəlki ilahi dinlərin bir növ tamamlayıcısıdır. Bu din özündən əvvəlki haqq dinlər kimi bəşəriyyəti nicata çatdırmaq və onu əbədi səadətə qovuşdurmaq hədəfinə malikdir. Allah-təala bu dinin vasitəsi ilə insanlara vəd etdiyi behiştin yollarını göstərir.

---

[1] Zariyat, 56

İslam dininin elmə və mərifətə böyük əhəmiyyət verməsinin səbəbi insanın məhz bunun vasitəsi ilə öz yolunu müəyyən edə bilməsi və həmin yolda qarşıya çıxan maneələri dəf etməkdə elmindən əldə etdiyi bəsirətidir. İslam dinində ən fəzilətli elm üçdür: əqaid, fiqh və əxlaq.

Bu elmlər içində ən fəzilətlisi əqaid elmidir. Çünki əqaid elminin mövzusu Allaha, Onun sifətlərinə, peyğəmbərlərə, imamlara,qiyamət gününə və s. şeylərə iman etməkdən ibarətdir. İnsanın yaradılış hədəflərinin ən əsası Allahı tanımaq, Ona və Onun dediklərinə iman gətirmək olduğu üçün bütün bunlardan bəhs edən elm ən fəzilətli elmdir. Çünki bu elm yaradılışın əsas məğzindən danışan bir elmdir.

Əqaid elmindən sonra fəzilətdə digər elmləri üstələyən isə fiqh elmidir. Fiqh insanı Allahı tanıdıqdan sonra Ona doğru aparacaq bir yoldur. İnsanın Allahı tanıdıqdan sonra olan ən böyük vəzifəsi Allaha tərəf hərəkət etməsi və bütün İlahi məqamları fəth etməsidir. Bu məqamları fəth etməyin yolu isə Allahın fiqhdə təyin etdiyi qanunlara riayət etməkdir. Fiqh elmində olan əsaslı bəhslərdən biri də insanın qidalarına nəzər yetirməyi və qidalarda olan halal və

haramlarda diqqətli olmağıdır. Allah-təala Qurani-kərimdə buyurur:

فَلْيَنظُرِ الْإِنسَانُ إِلَى طَعَامِهِ

**"Qoy insan yediyinə diqqət yetirsin!"**[1]

Allah-təala bu ayədə insanın yediyi qidasının əhəmiyyətini bildirərək insanın həmin qidalardan istifadə edərkən diqqətli olmasını bəyan edir.

İslam dini bu mövzuya böyük əhəmiyyət vermiş və fiqh elmində bununla əlaqədar ayrıca mövzu açaraq geniş şəkildə hökmlər təyin etmişdir. Fiqh elmində bu mövzu ilə bağlı hökmlər "Ət'imə və əşribə" (yemək və içmək) adı altında ayrıca bir babda (fəsildə) təfsilatlı şəkildə izah olunmuşdur. Biz də bu mövzu ilə əlaqədar mömin qardaş və bacılarımızın istifadəsi üçün qarşınızdakı bu kiçik bir xidməti özümüzə vəzifə bilərək kitab yazmaq qərarına gəldik.

Qarşınızda olan bu kitab, boynumuzda böyük haqqı olan çox dəyərli ustadımız Höccətül-İslam vəl-müslimin Hacı Hüseyn Əlizadənin elm və tədrisinin bir bəhrəsidir. Allah təbarəkə və təala onu Əhli-beytin (ə) həqiqi xadimlərindən

---

[1] Əbəsə, 24

qərar versin və onu qiyamət günündə Əhli-beyt (ə) ilə məhşur etsin. Amin!

Yuxarıda qeyd etdiyimiz kimi bu kitab yemək və içməklə əlaqədar olan fiqhi hökmləri əhatə edir. Fiqhi kitablarda bəzən bu mövzu ilə yanaşı bəzən isə ayrıca mövzu olaraq verilən "zibahə" (heyvan kəsimi) ilə əlaqəli olan fiqhi hökmləri də bura əlavə etdik. Bunu mövzunun bir-biri ilə əlaqəli olmasını nəzərə alaraq etmək qərarına gəldik.

Kitabda şəri hökmləri qeyd edərkən bəzən həmin hökmə dəlalət edən ayə və hədisləri də qeyd etmişik. Bəzən isə birbaşa olaraq fəqihlərin fətvasını qeyd etməklə kifayətlənmişik. Bəzən də şəri hökmü birbaşa hədis və ya ayənin vasitəsilə qeyd etmişik. Həmçinin fətvaları bəzən ayrıca olaraq bəzən də mətnin içərisində yazmışıq. Kitabın bu tərzdə olması zənnimizcə oxucuları çox yormaz, əksinə onu daha da maraqlı və oxunaqlı edər.

Kitabda aşağıda adları keçən mərcəi-təqlid müctəhidlərin fətvalarından istifadə etməyə çalışmışıq:

*Ayətullah əl-üzma Seyyid Əbul-Qasim əl-Xoyi*
*Ayətullah əl-üzma Şeyx Cavad Təbrizi*
*Ayətullah əl-üzma Şeyx Vəhid Xorasani*
*Ayətullah əl-üzma Seyyid Əli Sistani*

Həmçinin kitabın tərtibatında təfsilatlı və istidlali[1] şəkildə yazılmış fiqhi kitablardan geniş istifadə edilmişdir. Həmin kitablar aşağıdaklardır:

*«Məsalikul-əfham» , Şəhid Sani (r.ə.).*

*«Cəvahirul-Kəlam», Şeyx Muhəmməd Nəcəfi (r.ə).*

*«Fiqhus-Sadiq», Ayətullah əl-üzma Seyyid Sadiq Ruhani.*

*«Fiqhul-İmam Cəfəris-Sadiq», Muhəmməd Cavad Muğniyyə (r.ə.).*

Kitabın redaktə olunmasında və bəzi dini məlumatların qeyd olaraq əlavə edilməsində ustadımız Hacı Hüseyn Əlizadənin tələbəsi, alim qardaşımız Kərbəlayi Fəqan Məmmədovun da xidməti böyük olmuşdur.

Bundan əlavə kitabın redaktəsində, həmçinin müəyyən yerlərdə bioloji terminlərin düzgün və dəqiq olmasında yaxından kömək etmiş dəyərli həkim, tibb elmləri namizədi Bayram Piriyevə dərin təşəkkürümüzü bildiririk.

Ümumilikdə kitabın yazılıb tərtib olunmasında xidməti olmuş bütün mömin qardaşlarımıza minnətdarlığımızı bildirir, Allah-təaladan onlara xüsusi inayətini nazil etməyini diləyirik.

[1] İstidlal- Hər hansısa bir mövzunun dəlilinin göstərilərək izah olunmasıdır. Fiqhdə istidlal deyildikdə şəri məsələnin Kitab, sünnə, icma və əqldən olan dəlilinin bildirilməsidir.

Bunu da qeyd etməliyik ki, qarşınızdakı bu kitab naqis olan elmimizin bir bəhrəsi olduğu üçün səhv və xətalardan qorunmamışdır. Bu səhv və xətaların bir hissəsi bizim elmimizin naqisliyindən, digər bir hissəsi isə bizdən asılı olmayan səbəblərdən ola bilər. Buna görə də kitabın bütün oxucularından hər hansısa bir səhv və xəta ilə üzləşdikdə bizə bildirmələrini xahiş edirik.

*Bu kiçik əməlimizin müqabilində əziz mömin və mömінələrdən axirətimiz üçün dua etmələrini diləyirik. Allah-Təala bütün mömin bacı və qardaşlarımızı dünyada halal və pak nemətlərlə, axirətdə isə Peyğəmbər (s) və Əhli-beytinin (ə) şəfaəti ilə ruziləndirsin. Amin!*

***Əli Abdullah***

***eli.abdullah@facebook.com***

***Bakı***

***25 Mart 2012***

***2 Cəmadiul-əvvəl 1433***

# MÜQƏDDİMƏ

## Fiqh elmi

Elmlər arasında əqaid elmindən sonra ən şərəflisi fiqh elmidir. Çünki Fiqh mükəlləfin (boynuna şəri vəzifə gəlmiş şəxsin) əməlləri barəsində bəhs edən bir elmdir. Bu elm Allahın insanlar üçün təyin etdiyi əmr-qadağaları və onlara əməl olunma qaydalarını öyrədir. İnsanın kamillik dərəcəsi bu elm vasitəsilə tamamlanır. Bu sahənin alimləri isə fəqih adlanırlar.

Fiqh elminin fəziləti haqqında çoxlu hədislər nəql olunmuşdur. Onların bəzilərini əziz oxucuların nəzərinə çatdırırıq.

Peyğəmbər (s) buyurur:

إذا أراد الله بعبد خيرا فقهه في الدين

**«Allah Təala bəndəsinə xeyir vermək istədikdə onu dində fəqih edər.»**[1]

İmam Baqir (ə) buyurur:

الكمال كل الكمال : التفقه في الدين ، والصبر على النائبة ، وتقدير المعيشة

**«Kamilliklərin kamilliyi dində fəqih olmaq, bəlalara səbr etmək və məişəti təmin etməkdir.»**[2]

---

[1] İbn Şəhid Sani «Məalimud-din» səh.22
[2] «Məalimud-din» səh.23

İmam Sadiq (ə) buyurur:

**ما من أحد يموت من المؤمنين أحب إلى إبليس من موت فقيه**

**«Möminlərdən dünyasını dəyişən elə bir şəxs yoxdur ki, onun ölümü İblis üçün fəqihin ölümündən daha sevimli olsun.»**[1]

## Beş hökm

Yuxarıda qeyd olundu ki, fiqh mükəlləfin əməllərindən bəhs edən bir elmdir. Nəzərinizə çatdıraq ki, mükəlləfin əməli hər zaman beş hökmdən birinə aid olur. Həmin hökmlər aşağıdakılardır:

**1.Vacib** – o əmələ deyilir ki, onu tərk eləmək günah, yerinə yetirmək isə vacibdir. Məsələn, malın xümsünü vermək.

**2.Müstəhəbb** – o əmələ deyilir ki, onu tərk etmək günah deyil, lakin mükəlləf  o əməli icra etdikdə, savab qazanmış olur. Məsələn, yeməkdən əvvəl əlləri yumaq.

**3.Mübah** – o əmələ deyilir ki, onu tərk etmək nə savabdır, nə də günah. Həmçinin, o əməli yerinə yetirməyin də heç bir savabı və günahı yoxdur. Məsələn,  adi halda su içmək.

---

[1] «Məalimud-din» səh.23

**4.Məkruh** - o əmələ deyilir ki, onu tərk etmək savabdır. Onu icra etməyin isə heç bir günahı yoxdur. Məsələn, yeməyi qaynar olduğu halda yemək.

**5.Haram** – o əmələ deyilir ki, onu tərk etmək vacib, icra etmək isə günahdır. Məsələn, şərab içmək.

## I BÖLMƏ
## YEMƏK VƏ İÇMƏK

### Ümumi qayda

Muhəmməd Cəvad Muğniyyə «Fiqhul-İmam Cəfəris-Sadiq» kitabında yazır:

«Yeyiləsi və içiləsi şeylərin haramlığı haqqında nə xüsusi, nə də ümumi mənada dəlil (ayə və hədis) yoxdursa, Quran, sünnə, əql və icmaya (alimlərin ittifaqına) əsasən, onun yeyilməsi və içilməsi halaldır.»[1]

Bəzən ayə və hədislərdə bir şeyin haramlığı xüsusi olaraq qeyd olunur. Məsələn, Allah-təala Qurani-Kərimdə donuz ətinin haram olduğunu buyurur:

**إِنَّمَا حَرَّمَ عَلَيْكُمُ الْمَيْتَةَ وَالدَّمَ وَلَحْمَ الْخِنْزِيرِ وَمَا أُهِلَّ بِهِ لِغَيْرِ اللَّهِ**

***«Həqiqətən, (Allah) sizə ölmüş heyvanı, qanı, donuz ətini və (kəsilərkən başı üzərində) Allahdan başqasının adı çəkilmiş heyvanı haram etmişdir.»[2]***

Deməli, donuz ətinin haramlığı haqqında xüsusi dəlil mövcuddur.

[1] «Fiqhul-İmam Cəfəris-Sadiq» 4-cü cild; səh 366
[2] «Bəqərə» surəsi; 173-cü ayə

Bəzən isə ayə və hədislərdə bir şeyin haram olmağı ümumi olaraq qeyd olunur. Məsələn, İmam Rza (ə) buyurur:

وحرم سباع الطير والوحش كلها

**«Bütün yırtıcı quşlar və heyvanlar haramdır...»**[1]

Göründüyü kimi, bu hədisdə xüsusi olaraq hər hansı bir heyvanın yox, ümumiyyətlə yırtıcı heyvan ətinin yeyilməsinin haram olduğu buyurulur. Buna görə də biz hədisin ümumi mənasından istifadə edərək, xüsusi olaraq burada adları çəkilməyən pələng, canavar, çaqqal və s. bu kimi heyvanların (ətinin yeyilməsinin) haram olmasını söyləyə bilərik.

Deməli, əgər hər hansı bir şeyin haramlığı haqqında nə ümumi, nə də xüsusi mənada dəlil yoxdursa, həmin şey halal hökmündədir.

### Halal və haram qidaları ümumi mənada bəyan edən bir hədis

Şeyx Hərrani (r.ə.) «Tuhəful-Uqul» kitabında İmam Cəfər Sadiqdən (ə) nəql edir:

*«İmam (ə) buyurur: - Yerin bitirdiyi qidalardan insan üçün halal olanlar üç qismdir. Birinci qism, buğda, arpa, düyü, noxud və digər bütün dənli bitkilərdir... Dənli bitkilərdən hər*

[1] «Vəsailuş-şiə»; cild 24; səh 115; hədis 7

*hansında insan bədəni və qüvvəti üçün qida olsa, onun yeyilməsi halaldır. Əksinə, hər hansında insan bədəni və qüvvəti üçün zərər olsa, zərurət halı istisna olmaqla, onun yeyilməsi haramdır. İkinci qism, yerin bitirdiyi bütün meyvə növləridir. Əgər hər hansında insan üçün qida, mənfəət və qüvvət varsa, onun yeyilməsi halaldır. Yeyilməsi insan üçün zərərli olanlar isə haramdır. Üçüncü qism, bütün göyərti və tərəvəz növləridir. Əgər göyərti və tərəvəzin hər hansında insan üçün qida və mənfəət olsa, onun yeyilməsi halaldır. Amma hər hansının yeyilməsinin insan üçün zərəri olarsa, - məsələn, zəhərli otlar - onun yeyilməsi haramdır.*

*Heyvan ətlərinin halal olanlarına gəlincə, inək, qoyun və dəvənin əti halaldır. Vəhşi heyvanlardan köpək dişi (yırtıcı heyvanlarda ovunu tutub parçalamaq üçün olan uzun dişlər) və pəncəsi olmayanların əti halaldır. Quşlardan isə çinədanı (dənliyi) olanlar halal, çinədanı olmayanlar isə haramdır. Həmçinin, çəyirtkə yeməyin heç bir eybi yoxdur. Yumurtalardan hər iki tərəfi (qütbü, ucu) müxtəlif olanlar halal, eyni olanlar isə haramdır. Dənizdən ovlananlara gəlincə, balıqlar sinfindən yalnız pullu balıqların ətinin yeyilməsi halaldır. Pullu olmayan balıqların yeyilməsi isə haramdır. Çox içildiyi halda ağıla təsir etməyən (yəni insanı məst etməyən) içkilər halaldır. Lakin çox içildiyi halda ağlı*

*(normal əqli prosesləri) sıradan çıxararsa, ondan az miqdarda belə içmək haramdır.»*[1]

Əlbəttə qeyd etməliyik ki, bu hədisdə zikr olunmuş bəzi məsələlər şəkk halına aiddir. Məsələn, İmamın (ə) buyurduğu **"yumurtalardan hər iki tərəfi (ucu) müxtəlif olanlar halal, eyni olanlar isə haramdır"** cümləsi şəkk halına aiddir. Çünki İmam (ə) başqa bir hədisdə **"yalnız əti halal quşların yumurtaları halaldır"** [2] -deyə buyurur. Məlumdur ki, əti haram olan əksər quşların yumurtaları müxtəlif tərəflidir. Lakin müxtəlif tərəfli olmasına baxmayaraq, əti haram olan quşun yumurtası olduğu üçün haramdır. Deməli, əgər bir şəxs əti haram və ya halal quşdan olduğunu bilmədiyi bir yumurta taparsa, o zaman İmamın (ə) yuxarıdakı hədisdə buyurduğu qaydaya müraciət edərək tərəfləri müxtəlif olan yumurtanı halal qəbul etməlidir. Buna görə də halal və haram qidaların təsnifində yalnız bu hədislə kifayətlənmək olmaz. Hədisdə qeyd olunan və qeyd olunmayan məsələlərin geniş izahı sonsuz qüdrət sahibi olan Allah-Təalanın köməyi ilə gələcək səhifələrdə qeyd olunacaqdır.

---

[1] «Tuhəful-Uqul» səh 246
[2] «Fiqhul-İmam Cəfəris-Sadiq»; 4-cü cild; səh 367

# I FƏSİL
# HEYVANİ QİDALAR

## BALIQ VƏ SUDA YAŞAYAN DİGƏR HEYVANLAR

Suda yaşayan heyvanlar içərisində balıqlardan yalnız pullu balıqların əti halaldır. Pulsuz balıqların yeyilməsi isə haramdır. Balığın üzərində bir ədəd pul olsa da, onun halallığına kifayət edər.[1] Balığın pulları mikroskopik ölçüdə olmamalı, adi gözlə görünməlidir. Əks halda həmin (pulları "mikroskopla" təyin edilən) balıq haram hökmünə daxildir.

Muhəmməd ibn Müslim İmam Baqirdən (ə) pulsuz balıqların hökmü haqqında soruşduqda İmam (ə) belə cavab verir:

كل ما له قشر من السمك ، وما ليس له قشر فلا تأكله

**«Pulu olan balıqlardan ye! Pulu olmayanları isə yemə!»**[2]

Başqa bir hədisdə Əmirəl-möminin İmam Əlinin (ə) bu cür buyurduğu nəql olunur:

الا لا تأكلوا ، ولا تبيعوا ما لم يكن له قشر

**«Agah olun! Pulu olmayan balıqları satmayın və yeməyin!»**[1]

---

[1] Ayətullah Xoyi «Munyətus-sail» səh.176
[2] «Vəsailuş-şiə» cild 24; səh. 127; hədis 1

Dəniz ilanbalığı (lat. *Congre congre*), adi ilanbalığı (lat. *Anguilla anguilla)* və skorbit balığı (lat. *Gasterosteidae*) [2] haram balıqlar sırasına daxildirlər. Onların haram olması barədə Əhli-Beytdən (ə) nəql olunmuş hədisləri Şeyx Muhəmməd Hürr Amuli (r.ə.) «Vəsailuş-şiə» kitabında ayrıca bir babda cəm etmişdir.[3]

Molyuska, tısbağa, qurbağa, xərçəng və bütün suda-quruda yaşayanlar haramdır.[4] İmam Əli (ə) buyurur:

**لا يحل أكل الجرّي ، ولا السلحفاة ، ولا السرطان**

**«İlanbalığı, tısbağa və xərçəngi yemək halal deyildir.»**[5]

Hədisin davamında İmam (ə) qurbağaların da haram olduğunu buyurur.

**Krevetlər halaldırmı?** Krevetlərin halal olub-olmaması barədə tez-tez sual verilir. Səhih bir hədisdə Yunus ibn Əbdürrəhman Əbəl-Həsəndən (ə) krevetlər barəsində soruşduqda İmam (ə) belə cavab verir:

**لا بأس**

---

[1] «Vəsailuş-şiə» cild 24; səh. 129; hədis 6

[2] Bu balığın ərəbcə adı الزمير -dir. X.K. Baranovun «Bolşoy arabsko-russkiy slovar» lüğətinin 1-ci cild 334-cü səhifəsində bu sözün tərcüməsi “skorbit balığı” kimi qeyd olunur. Mümkündür hədislərdə qeyd olunan “skorbit balığı” yox, ərəbcə adları eyni olan başqa bir balıqdır.

[3] «Vəsailuş-şiə» cild 24; səh. 130; bab 9

[4] Ayətullah Sistani «Əl-fiqhu lil-muğtəribin» səh.143

[5] «Vəsailuş-şiə» cild 24; səh. 146; hədis 1

**«(Onu yeməkdə) heç bir eyb yoxdur.»**[1]

## MƏSƏLƏLƏR

1**.** Əgər balıq əvvəl pullu olub, sonra hər hansı bir səbəbə görə pulları tökülərsə, o balığın yeyilməsi halaldır. Bir gün bir nəfər İmam Sadiqdən (ə) balıqlar haqqında soruşur. İmam (ə) buyurur:

**ما كان له قشر ، (قال) : ما تقول في الكنعت ؟ قال : لا بأس بأكله**

**«Pulu olanları ye. (Həmin şəxs yenə soruşur): Bəs "kənət"** (bir balıq növü) **haqqında nə deyərsən? İmam (ə) cavab verir: Onun yeyilməsinin heç bir eybi yoxdur...»**[2]

Hədisdə adı keçən "kənət" balığı haqqında Şəhid Sani (r.ə) «Şərhi-Lümə» kitabında yazır: «Kənət zəif pulları olan bir balıq növüdür. (Suyun dibində) özünü quma sürtər və pulları tökülər. Sonra tökülmüş pulları (tədricən) yeniləri ilə əvəz olunar.»[3]

2. Yeyilməsi halal olan balıqların kürüləri halal, haram olan balıqların kürüləri isə haramdır. İmam Sadiq (ə) buyurur:

---

[1] Seyyid Sadiq Ruhani «Fiqhus-Sadiq» c.24 səh. 113
[2] «Vəsailuş-şiə» cild 24; səh. 137; hədis 1
[3] «Şərhi-Lümə» 3-cü cild; səh 207

ان البيض إذا كان مما يؤكل لحمه فلا بأس بأكله فهو حلال

**«Əgər yumurta əti halal olan heyvandandırsa onun yeyilməsinin heç bir eybi yoxdur. O, halaldır.»** [1]

3. İki balıqdan birinin halal, digərinin isə haram olduğu məlum, lakin hansının halal, hansının haram olduğu naməlumdursa, hər ikisindən çəkinmək vacibdir.

4. Pullu olub-olmadığı bilinməyən balığı yemək caiz deyil.

5. Qarşımızda halal yaxud haram olduğunu bilmədiyimiz kürü varsa, onu yemək caizdirmi (halaldırmı)? Bu barədə fəqihlərin görüşlərini nəzərinizə çatdırırıq:

*Ayətullah Xoyi, Ayətullah Xorasani və Ayətullah Təbrizi:* Əzhər (ən aşkar) nəzərə görə haramdır.[2]

*Ayətullah Sistani:* Həmin kürüdən (kürünü yeməkdən) çəkinmək vacibdir.[3]

6. Bəzi xəstəliklərin müalicəsi üçün balığı diri-diri yeməyi və ya udmağı məsləhət görürlər. Bəs, görəsən, şəri cəhətdən bu məsələnin hökmü necədir? İxtiyari halda, yəni heç bir zərurət olmadan balığı diri-diri yemək olarmı? Fəqihlər buyururlar: (İxtiyari halda heç bir zərurət olmadan) balığı diri-diri yemək olar.[4]

---

[1] «Vəsailuş-şiə»; əşribətul-muhərrəmə; bab 27; hədis 6
[2] «Minhacus-salihin» cild 2(3); məsələ 1680;
[3] «Minhacus-salihin»; cild 3; məsələ 880
[4] Xoyi və Təbrizi «Minhacus-salihin» c.2; məs. 1630; Xorasani «Minhacus-salihin» c.3; məs. 1630 Sistani «Tovzihul-məsail»; məsələ 2628;

7. Fərz edək ki, pullu bir balıq var. Balığı bişirmək istədikdə onun qarnından başqa bir pullu balıq çıxarsa, onu da yemək olar. [1] Əgər balığın qarnından çıxan balıq pulsuzdursa, onu yemək haramdır. Lakin *Ayətullah Seyyid Sistani* bu məsələdə fərqli fikir bildirir: «Həmin balığın halal olması mübahisəlidir. Ehtiyata əsasən, onu (balığın qarnından çıxan digər pullu balığı) yeməkdən çəkinmək lazımdır.»[2]

8. Pulsuz balığı həmin balıqların haram olmasına əqidəsi olmayan şəxsə (məsələn, sünni məzhəbindən olan müsəlmanlara) satmaq olar.[3]

## ŞÜBHƏLƏR VƏ CAVABLARI

Əhli-sünnə məzhəbinin nümayəndələri bizə irad tutaraq deyirlər: “Nəyə əsasən pulsuz balıqları haram, pulluları isə halal bilirsiniz? Halbuki Allah-təala Quranda buyurur:

أُحِلَّ لَكُمْ صَيْدُ الْبَحْرِ وَطَعَامُهُ مَتَاعًا لَكُمْ وَلِلسَّيَّارَةِ ۖ وَحُرِّمَ عَلَيْكُمْ صَيْدُ الْبَرِّ مَا دُمْتُمْ حُرُمًا ۗ وَاتَّقُوا اللَّهَ الَّذِي إِلَيْهِ تُحْشَرُونَ

***«Sizin və müsafirlər üçün bəhrələnmək vasitəsi olsun deyə sizə (ehram halında olarkən) dənizdən ov ovlamaq***

---

[1] Xorasani «Minhacus-salihin» c.3; məs. 1679 ; Xoyi və Təbrizi «Minhacus-salihin» c.2; məs. 1679

[2] «Minhacus-salihin»; cild 3; məsələ 879

[3] Ayətullah Sistani “Kənzul-fətava” sual 30. *www.alseraj.net*

***və ondan yemək halal edildi! Nə qədər ki, ehramdasınız sizə qurudan ov ovlamaq haram buyuruldu. Qorxun o Allahdan ki, Onun hüzuruna toplanılacaqsınız.»*** [1]

Bu ayənin zahiri suda yaşayan bütün balıqların (istər pullu olsun, istərsə də, pulsuz) halal olduğuna dəlalət edir."

Cavab: İlk öncə qeyd edək ki, biz pullu balıqların halal, qeyrilərinin isə haram olduğunu dedikdə səhih və mötəbər hədislərə istinad edirik. Həmin hədislərin bir hissəsi əvvəlki səhifələrdə qeyd olunmuşdur.

Dəlil kimi göstərdiyiniz ayənin zahiri mənası heç də dənizdə (suda) yaşayan bütün balıqların halal olmasına dəlalət etmir. Ayənin siyaqından[2] məlum olur ki, burada söhbət halal və haram qidalardan deyil, ehram halında insana hansı işlərin halal və haram olmasından gedir. Çünki ehram halında bəzi halal işlər insana haram olur (məs: ətirlənmək, izdivac etmək və s.). Quruda ov etmək də ehram halında haram olan işlərdəndir. Lakin ehram halında bütün ovlar haram edilməyib. Çünki suda ov etmək ehram halında haram deyil. Bu ayə də ehram halında olan şəxsə suda ov etməyin halallığını bildirir.

---

[1] Maidə, 96

[2] Siyaq- Quran elmlərində olan qaydalardan biridir. Hər hansı bir ayənin özündən əvvəl və özündən sonrakı ayələrlə rabitədə olması nəzərdə tutulur. Bu cür ayələrin təfsirində özündən əvvəl və sonrakı ayələrin məzmununa da diqqət yetirildikdən sonra həmin ayənin mənası izah olunur.

Ayənin zahirindən məlum olan məna budur ki, ehramdan əvvəl dənizdən ov etdiyiniz kimi, ehram halında da ov edib onu yeyə bilərsiniz. Bu ayə pulsuz balıqların haram, pulluların isə halal olması ilə heç bir ziddiyət təşkil etmir. Yəni necə ki, ehramdan əvvəl pullu balıqları ovlamaq və yemək sizə halal idisə, eləcə də ehram halında da onları ovlamaq və yemək sizə halal edildi.

Sizin iradınızda olan məntiq bundan ibarətdir ki, əgər dəniz ovu halal edildi deyilibsə, deməli, bütün dəniz heyvanları insan üçün halaldır. O zaman biz sizə irad edərək deyirik: Əvvəla əgər sizin dediyiniz sözü qəbul etsək o zaman gərək ayənin siz deyən mənasını bütünlüklə qəbul edək. Yəni necə ki, ayədə dəniz ovu deyildikdə heç bir qeyd vurulmayıb, o zaman biz də dənizdə yaşayan və yeməli olan canlılar arasında fərq qoymamalıyıq. Əgər balıqların pullu və ya pulsuz olmasında heç bir fərq yoxdursa və həmin hökmü bu ayədən istidlal ediriksə o zaman niyə sair suda yaşayan heyvanlara bu hökmü aid etmirik? Suiti kimi heyvanların haram olmasını niyə iddia edirik? İkincisi Allah-təala ayənin ikinci hissəsində buyurur: «***Nə qədər ki, ehramdasınız sizə qurudan ov ovlamaq haram buyuruldu.»*** Ayənin məfhumu budur ki, ehram halından çıxdıqdan sonra sizə qurudan ov ovlamaq halaldır. Sizin məntiqinizə əsasən, deməliyik ki, adi halda (yəni ehram halında olmadıqda) qurudan ovlanılan hər bir heyvanın əti

halaldır. Halbuki nə sizin, nə də bizim fiqhimizdə belə bir hökm yoxdur.

Əhli-sünnə qardaşlarımızın gətirdikləri digər bir irad isə budur: “Sizin pullu və pulsuz balıqlar barədə verdiyiniz hökm yəhudilərin Tövratından qaynaqlanır. Çünki məhz Tövratda pullu balıqların halal, pulsuzların isə haram olması qeyd olunur.”

Cavab: Yuxarıda qeyd etdiyimiz kimi, təkrar bildiririk ki, bu hökm Məsumlardan (ə) nəql olunmuş səhih və mötəbər hədislərdən qaynaqlanır. Tövratla olan uyğunluğa gəlincə, bu cür uyğunluqlar tək bizim yox, hətta sizin fiqhi hökmlərinizdə də mövcuddur. Sünni qardaşlarımızın fiqhi məsələlərindən bəhs edən «Əl-fiqhu ələl-məzahibil-ərbəə» kitabından bəzi hökmlərin Tövratla uyğunluğunu qeyd edirik:

Əhli-sünnə alimləri deyirlər:

**«Yarasa əti haramdır.»**[1]

Tövratda yazılır:

**«Uçanlardan bunların ətini yeməyəcək və murdar sayacaqsınız: ...** *(onlardan biri də)* **yarasa.»**[2]

Əhli-sünnə alimləri deyirlər:

**«Çəyirtkə yemək halaldır.»**[3]

Tövratda yazılır:

---

[1] Əbdürrəhman əl-Cəziri «Əl-fiqhu ələl-məzahibil-ərbəə» cild 4, səh. 5
[2] Levilər 11:19
[3] «Əl-fiqhu ələl-məzahibil-ərbəə» cild 4, səh. 6

**«Bunları yeyə bilərsiniz: Çəyirtkə növləri, kiçik çəyirtkə ...»**[1]

Əhli-sünnənin hənəfi alimləri deyirlər:

**«Kərtənkələ yemək haramdır. Çünki o iyrənclərdən sayılır.»**[2]

Tövratda yazılır:

**«Bütün kərtənkələ növləri sizin üçün murdar sayılır...»** [3]

Misalları çoxaltmaq da olar. Lakin zənnimizcə insaf əhli üçün bu miqdar kifayət edər. Fiqhi hökmlərin Tövratda olan hökmlərlə uyğun olması heç kimə əsas vermir ki, həmin hökmlərin islam şəriətinə yəhudilərdən sirayət etdiyini desin. Digər bir tərəfdən Tövratdakı bəzi hökmlərin İslam şəriətində olan bəzi hökmlərlə uyğun olması təbii məsələdir. Çünki hər bir müsəlman Tövratın da Qurani-Kərim kimi, Allah tərəfindən nazil edildiyinə inanır. Sadəcə olaraq, hal-hazırda mövcud olan Tövrat (məxsusən əqidəvi məsələlərdə) təhrif edilmiş formadadır. Amma təhrif edilmiş olması o demək deyildir ki, Tövratdakı bütün hökmlər dəyişdirilmişdir. Ona görə də Tövratda olan bəzi hökmlərin İslami hökmlərlə uyğun olması təbii və gözlənilən bir məsələdir.

---

1 Levilər 11:22

2 «Əl-fiqhu ələl-məzahibil-ərbəə» cild 4, səh. 6 qeyd 7

3 Levilər 11:30

## NƏRƏLƏR

Axtardığımız ədəbiyyatların[1] heç birində nərələr fəsiləsi (lat. *Acipenseridae*) balıqlarının pullu olduğuna rast gəlmədik. Bu fəsiləyə aid olan balıqların bədəni pulcuqlar əvəzinə sümük çıxıntılarla örtülmüşdür. Nərələrin üzərində olan bu çıxıntıların ingiliscə mənasına baxdıqda hər şey daha dəqiq aydın olur. Çünki ingilis dilində bu sümük çıxıntılara "scuta" , balıq puluna isə "scale" deyilir. Gördüyünüz kimi, sözlər və mənalar fərqlidir. Həmçinin İ.F. Pravdin «Rasskaz o jizni rıb» kitabında yazır: «Nərəkimilərin bədəni **pul əvəzinə** beş cərgədən ibarət möhkəm konusvari qalxanlarla (sümük çıxıntılarla) örtülmüşdür.» [2] Bundan əlavə, onların baş hissəsində pulların olması barədə məlumata da rast gəlmədik.

Qeyd edək ki, ağbalıq (lat. *Huso huso*), uzunburun (lat. *Acipenser stellatus*) və kələmo balığı (lat. *Acipenser nudiventris*) nərələr fəsiləsinə aiddirlər.

Beləliklə, qeyd etdiklərimizə əsasən, nərələr fəsiləsinə aid olan balıqlar pulsuzdur. İstisnasız olaraq hər bir müctehidin fətvası budur ki, pullu balıqlar halal, pulsuzlar isə haramdır. Deməli, nərələr fəsiləsinə aid olan balıqların yeyilməsi haramdır.

---

[1] E.D.Vasilyeva «Jizn jivotnıx, rıbı», səh.53; «Bioloqiçeskiy slovar» ensiklopediyası səh.434; İ.F. Pravdin «Rasskaz o jizni rıb» səh.236

[2] İ.F. Pravdin «Rasskaz o jizni rıb» səh.236

Bir məsələni də qeyd etmək yerinə düşərdi ki, heç bir müctehid bu balıqların halal olmasına fətva verməmişdir. Çünki hədislərdə yalnız pullu balıqların halal, pulsuz balıqların isə haram olması qeyd edilmişdir. Nərə balığı haqqında isə heç bir xüsusi dəlil qeyd olunmamışdır. Əgər nərə balıqlarının pulu varsa, bu hər bir müctehidin nəzərinə əsasən, halaldır. Yox, əgər pulu yoxdursa, hər bir müctehidin nəzərinə görə, haramdır. Bilmək lazımdır ki, balığın pullu olub-olmamasını müctehid təyin etmir. Bunu ya insanın özü gözlə görməli, ya iki adil şəxs o balıqda pul gördüklərini deməli, yaxud da həmin sahənin mütəxəssislərinin sözündən əminlik (yəqinlik) əldə etməlidir. Mütəxəssislər isə bu balıqların bədəninin pulla yox, sümük çıxıntılarla örtülü olduğunu qeyd edirlər.

Ən doğrusunu Allah bilir!

## SKUMBRİYALAR

Ölkəmizdə skumbriya balıqlarının əsasən atlantik skumbriyası (lat. *scomber scombrus*), yapon skumbriyası ( lat. *scomber japonicus*) və avstraliya skumbriyası ( lat. *scomber australasicus*) növləri istifadə olunur. Balıq mütəxəssislərinin kitablarından [1] əldə etdiyimiz

[1]Lebedev V.D., Spanovskaya V.D., Savvaitova K.A., Sokolov L.İ., Çepkin E.A. "Rıbı SSSR"; E.D.Vasilyeva «Jizn jivotnıx, rıbı»

məlumatlarda, bu balıqların bədənində az da olsa xırda pulların olduğu qeyd edilmişdir.

## BALIQ OVU

Balığın halal olması üçün onun sudan diri çıxarılması lazımdır. İmam Sadiq (ə) buyurur:

قال : ان السمك ذكاته اخراجه من الماء ، ثم يترك حتى يموت من ذات نفسه وذلك أنه ليس له دم

**«Balığın halal olması onun sudan çıxarılması ilə həyata keçər. Sonra onu sərbəst buraxarlar ki, öz-özünə ölsün. Bu ona görədir ki, onun atıcı qanı yoxdur.»**[1]

Deməli, əgər pullu bir balıq diri halda sudan çıxarılsa və sudan kənarda can versə, yeyilməsi halaldır. Əgər suda ölsə atıcı qanı olmadığına görə pakdır, lakin yeyilməsi haramdır.

Əgər balıq sudan diri halda tutulsa, lakin ölməmiş hər hansı bir yolla yenidən suya qayıtsa və orada ölsə onun yeyilməsi caiz deyildir. İmam Sadiq (ə) bu məsələ haqqında buyurur:

لا تأكله ، لأنه مات في الذي فيه حياته

**«(O balığı) yemə! Çünki o, ona həyat verən bir şeydə (suda) ölmüşdür.»** [1]

---

[1] «Vəsailuş-şiə»; əz-zəbaih; bab 31; hədis 8

Əgər balıq sudan kənara düşsə, ya dalğa onu sudan kənara atsa, ya həmin yerin suyu qurusa, ölməmişdən əvvəl bir kəs onu əllə yaxud başqa bir vasitə ilə tutsa, can verdikdən sonra halaldır. Əks halda haramdır. İmam Sadiqə (ə) belə bir şərait haqqında sual verdilər və İmam (ə) buyurdu:

**ان اخذها قبل ان تموت ، ثم ماتت فكلها ، وان ماتت قبل ان تأخذها فلا تأكلها**

**«Əgər (həmin) balığı ölməmişdən qabaq tutsan və sonra ölsə, onu yeyə bilərsən. Amma əgər onu tutmamışdan öncə ölərsə, onu yemə!»**[2]

Lakin balıqçının toruna düşdükdən sonra suda ölərsə, yeyilməsi halaldır.

Qeyd edək ki, krevetlərin də halal olması üçün sudan diri çıxarılmaları lazımdır.

## BALIQ OVUNA AİD MƏSƏLƏLƏR, HÖKMLƏR.

1.Balığı ovlayan şəxsin müsəlman olması və balığı tutarkən Allahın adını çəkməsi vacib deyil. Lakin müsəlman ya onun tutulmasını görməli, ya da başqa bir yolla balığın diri halda tutulub sudan kənarda və ya tora düşdükdən

---

[1] «Vəsailuş-şiə»; əz-zəbaih; bab 33; hədis 2

[2] «Vəsailuş-şiə»; əz-zəbaih; bab 24; hədis 1

sonra suyun içində can verdiyinə xatircəm olmalıdır. Yaxud da buna başqa bir şəri dəlili olmalıdır. Məsələn, iki nəfər adil şəxsin xəbər verməsi kimi.

2. Sudan diri, yoxsa ölü tutulması məlum olmayan balıq müsəlmandan yaxud müsəlman bazarından alınarsa, halaldır. Lakin kafirdən alınmış balıq, kafir satıcı "balığı diri tutmuşam"-desə belə, haramdır. Əgər kafir satıcının balığı diri tutmasına dair şəri dəlil olsa, yaxud sözünün əksi güman olunmayan siqə (doğru danışan) bir şəxs xəbər versə və yaxud kafirin həmin balığı müsəlmandan aldığı bilinərsə halaldır.

Ayətullah Sistaninin «Əl-fiqhu lil-muğtəribin» kitabında qeyd olunur:

«Qəbul olunub ki, təqribən bütün ölkələrdə balıq ovu balığın sudan diri çıxarılması, ya da torda ölməsi ilə həyata keçir. Buna əsasən, müsəlmandan aldığımız kimi kafirdən də balıq əti alıb yemək olar (əlbəttə, balığın pullu olması şərti ilə).»[1]

## DÖRDAYAQLILAR

Ev heyvanlarından dəvə, inək, camış, qoyun və keçi kimi heyvanların əti halaldır. Vəhşi heyvanlardan isə dağ

[1] «Əl-fiqhu lil-muğtəribin» səh. 143

keçisi, çöl inəyi, ulağ (çöl uzunqulağı), ceyran, antilop kimi heyvanların əti halaldır. İmam Rza (ə) buyurur:

**وأحل الله تبارك وتعالى لحوم البقر والإبل والغنم**

**«Allah-Təala inək, dəvə və qoyun ətinin yeyilməsini halal etmişdir...»**[1]

Əbdullah ibn Cündəb deyir:

**سألت أبا الحسن عليه السلام عن لحوم الجواميس وألبانها فقال : لا بأس بها**

**«İmam Əlidən (ə) camış əti və südü barəsində soruşdum. Buyurdu: Heç bir eybi yoxdur.»**[2]

Həmçinin ev heyvanlarından at, uzunqulaq (eşşək) və qatırın da əti halaldır. Lakin onların yeyilməsi məkruhdur. Bu heyvanlar haqqında nəql olunmuş hədislərin birində İmam Sadiq (ə) buyurur:

**وليس بحرام**

**«Onların əti haram deyil.»**[3]

Bu hədisdən at, qatır və uzunqulağın haram olmadığı məlum olur. Lakin digər bir hədisdə İmamdan (ə) həmin üç heyvan haqqında soruşulduqda İmam (ə) bu cür cavab verir:

---

[1] «Vəsailuş-şiə» 25-ci cild; səh. 50 hədis 3.
[2] «Vəsailuş-şiə» 25-ci cild; səh 52 h.1
[3] «Vəsailuş-şiə» cild 24; səh. 124; hədis 7

لا تأكلها

**«Onları yemə!»**[1]

İmamın (ə) bu sözündən isə haqqında danışdığımız heyvanların məkruh olduğu məlum olur. Yəni o heyvanların ətini yemək haram deyil halaldır. Lakin yeməməyin savabı vardır. [2] Buna görə də ikinci hədisdə İmam (ə) “onları yeməyin”-deyə buyurur. «Şərhi-Lümə» kitabında qatırın at və uzunqulağa nisbətən daha şiddətli məkruh olduğu qeyd olunur. Şəhid Sani (r.ə.) bunun səbəbində yazır: «Çünki qatır at və uzunqulağın izdivacından əmələ gəlir. At və uzunqulaq hər ikisi məkruhdur. Nəticədə iki məkruh cəm olur (yəni iki məkruh heyvanın cütləşməsindən əmələ gələn heyvanın məkruhluğu daha şiddətlidir).»[3]

İt, donuz və çöl donuzunun (qabanın) əti haramdır. Donuz və çöl donuzunun haram olmasına dəlil Qurani-Kərimin bu ayəsidir:

**إِنَّمَا حَرَّمَ عَلَيْكُمُ الْمَيْتَةَ وَالدَّمَ وَلَحْمَ الْخِنْزِيرِ وَمَا أُهِلَّ بِهِ لِغَيْرِ اللَّهِ**

---

[1] «Vəsailuş-şiə» cild 24; səh. 122; hədis 5

[2] Çünki məkruh bir əməli icra etməkdə heç bir günah yoxdur. Lakin onu tərk etmək savabdır.

[3] «Şərhi-Lümə» 3-cü cild; səh 208

***«Həqiqətən (Allah) sizə ölmüş heyvanı, qanı, donuz ətini və (kəsilərkən başı üzərində) Allahdan başqasının adı çəkilmiş heyvanı haram etmişdir.»***[1]

İtin haram olmasına isə bir neçə cəhətdən dəlillər vardır:

1) Hədislərdə yırtıcı, köpək dişləri və pəncələri olan heyvanların haram olduğu qeyd olunur.[2] İtdə isə bu xüsusiyyətlər vardır.

2) Bəzi hədislərdə itin məsx [3] olunmuş heyvanlardan olduğu qeyd olunur.[4] Məsx olunmuş heyvanların əti isə haramdır.

---

[1] «Bəqərə» surəsi; 173-cü ayə

[2] «Fiqhul-İmam Cəfəris-Sadiq»; 4-cü cild; səh. 369

[3] Lüğətdə dəyişmə, çevrilmə mənalarına malik olan məsx sözü burada bir qrup insanın etdikləri günahlara görə Allah tərəfindən meymun, donuz və s. heyvanlara çevrilməsi mənasında işlədilir. Bəni-İsraildən olan bəzi ümmətlər bu bəlaya düçar olmuşlar. Allah-təala məsx haqqında Qurani-kərimdə buyurur:

قُلْ هَلْ أُنَبِّئُكُمْ بِشَرٍّ مِنْ ذَٰلِكَ مَثُوبَةً عِنْدَ اللَّهِ مَنْ لَعَنَهُ اللَّهُ وَغَضِبَ عَلَيْهِ وَجَعَلَ مِنْهُمُ الْقِرَدَةَ وَالْخَنَازِيرَ وَعَبَدَ الطَّاغُوتَ أُولَٰئِكَ شَرٌّ مَكَانًا وَأَضَلُّ عَنْ سَوَاءِ السَّبِيلِ

*De: «Sizə Allah yanında cəzaları (sizin irad tutduğunuz bu möminlərinkindən) daha pis olan kəslərdən xəbər verimmi? Onlar (sizin keçənlərinizdən) Allahın lənət etdiyi, qəzəbləndiyi,bəzisini meymunlar və donuzlar surətinə saldığı və Tağuta pərəstiş etmiş kəslərdir. Onlardır yerləri daha pis olan və düz yoldan daha çox azanlar!»* (Maidə, 60) -

- Allah-təala bu ayədə bəzi insanları meymun və donuzlara məsx etdiyini bildirir. Lakin məsx olunan heyvanlar ancaq meymun və donuzdan ibarət deyil. Rəvayətlərdə insanların bunlardan əlavə digər heyvanlara da çevrildiyi bildirilir.

[4] «Vəsailuş-şiə»; cild 24; səh. 105; hədis 3

3) Hədislərə əsasən it murdar (nəcis) hökmündədir. Murdar (nəcis) olan bütün şeylər isə İslam şəriətində haram hesab olunur.

Həmçinin pişiyin də əti haramdır. Çünki pişik yırtıcı heyvanların bir növüdür. Yırtıcı heyvanların əti isə haramdır. İmam Sadiq (ə) buyurur:

لا تأكل من السباع شيئا

**«Yırtıcı heyvanlardan heç nə yemə *(yəni onların əti, südü, piyi və s. haramdır).»*[1]**

Buna görə də şir, bəbir, canavar, pələng, ayı, çaqqal, kaftar, tülkü və digər yırtıcı heyvanların əti haram sayılır.

Kirpi və dovşan da əti haram olan heyvanlardandır. Şeyx Muhəmməd Həsən Nəcəfi (r.ə.) «Cəvahirul-Kəlam» kitabında yazır:

لا خلاف في أنه يحرم القنفذ

**«Kirpi ətinin haram olmasında heç bir ixtilaf yoxdur.»**[2]

Dovşan ətinin haramlığı haqqında isə İmam Rza (ə) belə buyurur:

[1] «Fiqhul-İmam Cəfəris-Sadiq»; 4-cü cild; səh. 369
[2] «Cəvahirul-Kəlam»; c.36; səh. 296

وحرم الارنب ، لانها بمنزلة السنور ، ولها مخاليب كمخاليب السنور وسباع الوحش

**«Dovşan əti haramdır. Çünki o pişik kimidir. Pişiyin və digər vəhşi heyvanların pəncəsi kimi onun da pəncəsi vardır...»**[1]

Həmçinin, porsuq əti də haramdır, çünki Məsumlardan (ə) gələn hədislərdə köpək dişi və pəncəsi olan heyvanların haram olduğu buyurulmuşdur. Porsuqda isə bunların hər ikisi var.

Şeyx Nəcəfi (r.ə.) öz kitabında siçan, siçovul, dələ, sincab kimi heyvanların da haram olduğunu yazır.[2] Çünki bu heyvanların haram olması barədə kifayət qədər mötəbər hədislər nəql olunmuşdur. İxtisara riayət etmək üçün həmin hədisləri qeyd etmirik.

## MƏSƏLƏLƏR

1. Cəllal heyvanın əti və südü haramdır. İmam Cəfər Sadiq (ə) buyurur:

لا تأكلوا لحوم الجلالات

**«Cəllal heyvanların ətindən yeməyin... »** [3]

---

[1] «Vəsailuş-şiə»; cild 24; səh. 109; hədis 11
[2] «Cəvahirul-Kəlam»; c.36; səh. 297
[3] «Vəsailuş-şiə»; cild 24, səh. 164; hədis 1

Cəllal heyvan insan nəcisi (ğaiti) yeməyə adət etmiş heyvana deyilir. Əgər heyvan bir müddət insan nəcisi yesə və camaat arasında «artıq bu heyvanın sümüyü və əti insan nəcisinin vasitəsilə bərkiyib» deyilərsə, həmin heyvan cəllal sayılır və yeyilməsi haramdır. Əgər heyvan insan nəcisi ilə deyil, başqa nəcislərlə qidalanarsa və yaxud insan nəcisi ilə birlikdə başqa yemlər də yeyərsə, cəllal sayılmaz. Cəllal heyvanın bövlü (sidiyi) və ğaiti (peyini) nəcisdir.

Cəllal hökmü yalnız dördayaqlılara deyil, quşlara və balıqlara da şamil olur. Deməli, insan nəcisi yeməklə quş və balıqların əti, həmçinin, yumurta və kürüsü haram olur. Cəllal heyvan istibra yolu ilə paklanar. Bunun üçün həmin heyvanın müəyyən bir müddət ərzində nəcis yeməsinin qarşısı alınmalı və pak yemlərlə yemlənilməlidir. Dəvənin istibrası 40 gün, inəyin 20, qoyunun 10, ördəyin 5 və ya 7, toyuğun 3 , balığın istibrası isə bir gün və bir gecədir.

2. Əgər bir şəxs əti halal olan heyvanla -nəuzu billah- cinsi əlaqədə olarsa (sperma xaric olmasa belə), həmin heyvanın əti və südü, həmçinin o heyvandan törəyənlərin əti və südü haram olar.[1]

İmam Əli (ə)-dan yaxınlıq edilmiş heyvan barəsində soruşdular. İmam (ə) buyurdu:

حرام لحمها ، و لبنها

[1] Qeyd etmək lazımdır ki, bu hökm ancaq dörd ayaqlılara aiddir.

**«Onun əti və həmçinin südü haramdır.»**[1]

Əlaqədə olan şəxsin böyük və ya kiçik, ağıllı və ya dəli olmasının, bu əməlin haram olduğunu bilib-bilməməsinin və bu əməli ixtiyari yaxud məcburi halda etməsinin, həmçinin heyvanın erkək yaxud dişi olmasının heç bir fərqi yoxdur. Əgər həmin heyvan qoyun və ya inək kimi əti mübah olan heyvanlardan olarsa, həmin heyvan dərhal öldürülməli və cəsədi yandırılmalıdır. Yaxınlıq edən şəxs, isə həmin heyvanın sahibi deyilsə, heyvanın pulunu sahibinə ödəməlidir. Lakin həmin heyvan at, qatır və ya uzunqulaq olarsa, şəhərdən çıxarılmalı, başqa bir şəhərə aparılıb orada satılmalıdır. Yaxınlıq edən şəxs heyvanın sahibi deyilsə, pulu sahibinə verməlidir.

Fikrimizcə, bu məsələdə bir məqamı qeyd etmək yerinə düşərdi. Qəlbləri İslam ruhundan uzaq olan bəzi insanlar müsəlmanları haqqdan yayındırmaq üçün: "şiə alimləri heyvanla əlaqədə olmağı caiz bilirlər" - deyərək, haqq əhlinə qarşı çox iyrənc bir böhtan atırlar. Həmin insanların qəlblərində zərrə qədər olsa belə insaf qaldığına ümid edərək deyirik: Şiə məzhəbinin bütün alimlərinin nəzərinə əsasən heyvanla əlaqədə olmaq haram və böyük günahlardandır! Hətta İmam Sadiqdən (ə) nəql olunmuş bir

---

[1] «Vəsailuş-şiə»; cild 24; səh. 170; hədis 3

hədisdə əlaqədə olmuş şəxsin cəza olaraq şallaqlanmasının gərəkli olduğu qeyd olunur.[1]

3. Fərz edək ki, bir nəfərin -nəuzu billah- əlaqədə olduğu bir qoyun sürüyə qarışıb və onu digər qoyunlardan seçmək mümkün deyil. Bu halda nə edilməlidir? Onuncu imamımız İmam Əliyyən-Nəqi (ə) bu məsələ haqqında buyurur:

**فان عرفها ذبحها وأحرقها وان لم يعرفها قسم الغنم نصفين وساهم بينهما فإذا وقع على أحد النصفين فقد نجا النصف الآخر ثم يفرق النصف الآخر فلا يزال كذلك حتى تبقى شاتان فيقرع بينهما فأيهما وقع السهم بها ذبحت وأحرقت ونجا سائر الغنم**

**«Əgər həmin qoyun tanınırsa, onda onu kəsib sonra yandırmaq lazımdır. Əgər tanınmırsa, qoyun sürüsü iki hissəyə bölünməli və onlar arasında püşk atılmalıdır. İki hissədən birinə püşk düşdükdə, digər hissə sərbəst buraxılır. Qalan hissə isə yenidən iki qismə bölünür. Bu iş iki qoyun qalana qədər bu cür davam olunur. Sonra həmin iki qoyun arasında püşk atılar. Püşk hansına düşərsə o, kəsilər və yandırılar. Qalan qoyunlar isə sərbəst buraxılar.»**[2]

---

1 «Vəsailuş-şiə»; cild 24; səh. 169; hədis 2

2 «Tuhəful-Uqul» səh 354

4. Əgər çəpiş donuzdan "ətini və sümüyünü bərkidəcək" miqdarda süd əmərsə, çəpişin əti, südü, həmçinin, törəmələri və onların südü haram olar. O miqdardan az süd əmərsə, ehtiyata əsasən, istibra edilməlidir. Belə çəpiş keçinin və ya qoyunun döşündən 7 gün pak süd əmməklə istibra edilir. Əgər çəpişin süd əmməyə daha ehtiyacı yoxdursa, (böyümüşdürsə), 7 gün ot yeməlidir. Ehtiyata əsasən, eyni hökm südəmər quzu və digər əti halal olan heyvanların balalarına da aiddir. Lakin həmin heyvanlar itin yaxud kafirin döşündən süd əmərsə, onların əti haram olmaz.

5. Fərz edək ki, əti halal olan bir heyvan şərab içərək məst olub. Bu halda həmin heyvanı kəssək, əti halaldır və yeyilməsi caizdir. Amma onun içalatını -bağırsağını, ürəyini, ciyərini və s. yemək caiz deyil. Çünki İmam Sadiq (ə) şərab içib məst halında kəsilən heyvan haqqında buyurur:

**لا يؤكل ما في بطنها**

**«Onun içalatı yeyilməz.»**[1]

Əgər heyvanın ətinin hər hansı bir yerində şərabdan bir şey qalıbsa, həmin yer nəcis olduğuna görə, mütləq yuyulmalıdır. Amma əti halal olan heyvan digər nəcislərdən, məsələn, bövl (sidik) içərsə, onun ətinin və içalatının

---

[1] «Vəsailuş-şiə»; cild 24; səh. 160; hədis 1

yeyilməsi halal, lakin içalatı yumaq müstəhəbdir.[1] Çünki İmam Baqirdən (ə) sidik (bövl) içəndən sonra kəsilmiş qoyun haqqında soruşulduqda İmam (ə) belə cavab vermişdir:

يغسل ما في جوفها ، ثم لا بأس به

**«İçalatı yuyulduqdan sonra (onun yeyilməsinin) heç bir eybi yoxdur.»**[2]

Əgər heyvanın hər hansı bir yerində sidikdən bir şey qalıbsa, həmin yer nəcis olduğuna görə mütləq yuyulmalıdır.

6. Hədislərdə bəzi heyvanların məsx olunduğu və onların ətinin haram edildiyi qeyd olunur. Buna əsasən, fəqihlər (Allah hamısından razı olsun) həmin heyvanların haram olmasına dair fətva vermişlər. Məməli heyvanlardan fil, siçan, yarasa, dovşan, kirpi, ayı, donuz, it və meymunun məsx edilmiş olduğu nəql olunur.[3]

İmam Sadiq (ə) buyurur:

وحرم الله ورسوله المسوخ جميعا

**«Allah və Rəsulu bütün məsx olunmuşları sizə haram etmişdir.»**[4]

İmam Sadiq (ə) buyurur:

---

[1] «Fiqhul-İmam Cəfəris-Sadiq» cild 4; səh 381
[2] «Vəsailuş-şiə»; cild 24; səh. 160; hədis 2
[3] «Vəsailuş-şiə»; cild 24; səh. 104-113;
[4] «Vəsailuş-şiə»; cild 24; səh. 105; hədis 3

ان الضب والفارة والقردة والخنازير مسوخ

**«Kərtənkələ, siçan, meymun və donuzlar məsx olunublar.»**[1]

7. Donuz və ya başqa əti haram olan süfrədə əyləşməyin heç bir eybi yoxdur.[2]

## QUŞLAR

Bütün caynaqlı və yırtıcı quşların əti haramdır. Bu barədə Əhli-Beytdən (ə.s.) çoxsaylı hədislər nəql olunmuşdur. Onlardan bir neçəsini sizin nəzərinizə çatdırırıq. İmam Sadiq (ə) buyurur:

حرم رسول الله ( صلى الله عليه وآله ) كل ذي مخلب من الطير

**«Allah Rəsulu (s) bütün caynaqlı quşları haram etmişdir...»**[3]

İmam Rza (ə) buyurur:

وحرم سباع الطير والوحش كلها

**«Bütün yırtıcı quşlar və heyvanlar haram edilmişdir...»**[4]

1 «Vəsailuş-şiə»; cild 24; səh. 104; hədis 1
2 Xoyi «Fətava əl-Xoyi» "ətimə və əşribə" www.alseraj.net
3 «Vəsailuş-şiə»; cild 24; səh. 114; hədis 3
4 «Vəsailuş-şiə»; cild 24; səh. 115; hədis 7

Digər hədislərdə əti haram olan quşların başqa əlamətləri də qeyd olunur. Onlardan biri də budur ki, havada süzməyi qanad çalmağından çox olan quşların əti haramdır.

İmam Sadiq (ə) buyurur:

**فكان دفيفه أكثر من صفيفه أكل ، وإن كان صفيفه أكثر من دفيفه فلا يؤكل**

**«Əgər quşun qanad çalmağı süzməyindən çoxdursa, (onun əti) yeyilər, amma süzməyi qanad çalmağından çox olarsa, (əti) yeyilməz. »**[1]

Quşların haramlıq əlamətlərindən biri də quşda çinədan (dəncik), pətənək (mədə) və ya mahmızın ( ayağının arxasında olan barmaq) olmamasıdır. Əgər bu üç üzvdən biri onda olarsa, əti halaldır. İmam Əli (ə) buyurur:

**تنزهوا عن اكل الطير الذي ليست له قانصة ولا صيصية ولا حوصلة**

**«Pətənəyi, mahmızı və çinədanı olmayan quşları yeməkdən çəkinin...»**[2]

Nəticə etibarı ilə məlum oldu ki, əti haram olan quşlar əti halal olanlardan üç əlamətə görə fərqlənir:

1.Yırtıcı və caynaqlı olması ilə;

---

[1] «Cəvahirul-Kəlam»; cild 36; səh 305

[2] «Vəsailuş-şiə» cild 24, səh. 117, hədis 10

2.Havada süzməyinin qanad çalmağından çox olması ilə;

3.Çinədan, pətənək və mahmızının olmaması ilə.

## MƏSƏLƏLƏR

1. Qartal və şahin kimi bütün yırtıcı və caynaqlı quşların əti haramdır. Həmçinin, süzməyi qanad çalmağından çox olan hər bir quşun əti haramdır.

2. Süzməyi qanad çalmağından çox olan, lakin yırtıcı və caynaqlı olmayan quşun əti haramdır.

3. Süzməyi qanad çalmağından çox olmayan, lakin yırtıcı və caynaqlı olan quşun əti haramdır.

4. Əgər quş yırtıcı deyilsə və qanad çalmağı ilə süzməyi bərabərdirsə və ya onlardan hansının çox olması bilinmirsə, o zaman əti haram olan quşları tanımaq üçün yuxarıda qeyd etdiyimiz üçüncü əlamətə müraciət etməliyik. Yəni belə bir quşda əgər bu üç üzvün - çinədan, pətənək, ya mahmızın - hamısı və ya biri varsa, onun əti halal, əks təqdirdə isə haramdır.

5. Əgər quşun çinədanı, pətənəyi yaxud mahmızı yoxdursa (yəni bu üç üzvdən heç biri olmasa), amma quşun qanad çalmağı süzməyindən çox olsa, həmin quşun əti halaldır.

6. Əgər quşda üç üzvdən biri ( çinədan, pətənək və mahmız) və ya hamısı varsa, amma quşun süzməyi qanad çalmağından çoxdursa, onun əti haramdır.

7. Əgər quşda üç üzvdən biri ( çinədan, pətənək və mahmız) və ya hamısı varsa, amma onun uçuşunun necəliyində şəkk olunursa, həmin quşun əti halaldır.

8. Yuxarıda qeyd etdiklərimizə əsasən, qartal, şahin, qızılquş, qırğı, quzğun və s. yırtıcı quşlar, həmçinin qarğanın bütün növləri haramdır. Hətta vacib ehtiyata əsasən[1] dolaşa (lat. *Corvus monedula,* ərəbcə*,zağ*) ətindən də çəkinmək lazımdır.

9. Toyuq, göyərçin və sərçənin bütün növləri halaldır. Habelə qırqovul, kəklik, qarabağır, cüllüt, bildirçin, qaşqaldaq, ördək, qaz, dovdaq kimi quşlar halaldır.

10. Torağay, ağacdələn, şanapipik (hop-hop və ya hüd-hüd) və qaranquşun əti məkruhdur.[2]

*Ayətullah Sistani:* Şanapipik, qaranquş və ağacdələnin əti halaldır (mübahdır). Lakin onları öldürmək məkruhdur. [3]

11. Dəvəquşunun əti halaldır. [4]

12. Cəllal quşun, yəni insan nəcisi yeməyə adət etmiş quşun əti və yumurtası haramdır. Onların istibra (paklanma) qaydası səhifə 39-da izah edilmişdir. Həmin məsələdə adları qeyd olunmamış quşların istibra müddəti camaat

---

[1] Sistani «Məsailul-muntəxəbə»; məsələ 1222

[2] Xoyi və Təbrizi «Minhacus-salihin» cild 2; məsələ 1690; Xorasani «Minhacus-salihin» cild 3; məsələ 1690

[3] «Məsailul-muntəxəbə»; məsələ 1222

[4] Sistani «Məsailul-muntəxəbə»; məsələ 1222

arasında «artıq bu quş nəcis yeyən deyil» deyilə biləcək vaxta qədərdir.

**Tovuzquşu.** *Ayətullah Sistani:* Əqva (ən güclü) [1] nəzərə görə tovuzquşunun əti halaldır.[2]

*Digər müctehidlər:* Tovuzquşunun əti haramdır.[3]

**Leylək**. Leylək ətinin haramlığı və ya halallığı haqqında nə ayələrdə, nə də hədislərdə heç bir xüsusi dəlil yoxdur. *Ayətullah Xoyi, Ayətullah Xorasani və Ayətullah Təbrizi* bu quş haqqında belə yazırlar:

Bu quşda çinədan, pətənək və mahmız vardır. Amma güman olunur ki, onun havada süzməyi qanad çalmağından daha çoxdur. Buna görə də onun əti haramdır. Nəql olunanlara görə, bəzi (keçmiş) alimlər də bu cür fətva vermişlər.[4]

*Ayətullah Sistani:*

Bu quşun uçuşunu müşahidə edənlərin fikirləri müxtəlif olsa da, ( quşun halal ya haram olmasını təyin etmək üçün üçüncü) əlamətə (çinədan, pətənək və mahmızın olub-olmamasına) müraciət olunar (yəni əgər çinədan, pətənək

---

[1] Yəni tovuzquşunun əti haramdır deyənlər güclü dəlillərə əsaslanıb bunu deyirlər. Amma Ayətullah Sistaninin nəzərincə onun halallığının dəlilləri daha güclüdür.

[2] Sistani «Minhacus-salihin»; cild 3, məsələ 883

[3] Xoyi, Xorasani və Təbrizi «Minhacus-salihin» cild 2 (3); məsələ 1689;

[4] «Minhacus-salihin» cild 2 (3); məsələ 1688

və mahmızdan biri və ya hamısı leyləkdə olsa, onun əti halaldır).[1]

## YUMURTA

Əgər quşun əti haramdırsa, onda onun yumurtası da haramdır. Yox, əgər quşun əti halaldırsa, onda onun yumurtası da halal olar. Çünki İmam Sadiq (ə) buyurur:

ان البيض اذا كان مما يؤكل لحمه فلا بأس باكله ، فهو حلال

**«Əgər yumurta əti halal olan heyvandandırsa, onun yeyilməsinin heç bir eybi yoxdur. O, halaldır.»** [2]

Hədisdən göründüyü kimi İmam (ə) yumurtanın halal olması üçün heyvanın ətinin halal olmasını şərt qoyur. Burdan da başa düşülür ki, əgər heyvanın əti haram olarsa, yumurta da haram olar.

## MƏSƏLƏ

Bir nəfər İmam Cəfər Sadiqə (ə) meşədən müxtəlif yumurtalar tapdığını və onların əti haram yaxud halal quşlardan olduğunu bilmədiyini deyir və sual edir ki, mən nə etməliyəm? İmam Cəfər Sadiq (ə) buyurur:

---

[1] «Minhacus-salihin» cild 3, məsələ 885

[2] «Vəsailuş-şiə»; cild 24; səh. 165; hədis 7

اذا دخلت اجمة فوجدت بيضا فلا تأكل منه الا ما اختلف طرفاه

**«Əgər meşəliyə daxil olub yumurta tapsan, hər iki tərəfi müxtəlif olanlardan başqasını yemə!»**[1]

Bu və bu kimi hədislərə əsasən, fəqihlər fətva verirlər ki, əgər şəxs yumurtanın halal və ya haram olduğunu bilmirsə, yumurtanın tərəflərinə (uclarına, qütblərinə) baxmalıdır. Əgər həmin yumurtanın tərəfləri müxtəlifdirsə (məsələn, toyuq yumurtası kimi) onu yemək olar. Amma tərəfləri eyni olarsa, yemək caiz deyil.

Qeyd etmək lazımdır ki, bu məsələ yalnız şəkk halına aiddir. Əgər tərəfləri müxtəlif olan yumurtanın əti haram olan bir quşdan, məsələn, qarğadan olduğu bilinərsə, onda yumurtanın tərəflərinin müxtəlif olmasına baxmayaraq, onun yeyilməsi haramdır.

## ƏTİ HALAL OLAN HEYVANLARIN HARAM ÜZVLƏRİ

Əti halal olan heyvanların bəzi üzvlərinin yeyilməsi haramdır. Həmin üzvlərin sayında fəqihlər ixtilaf etmişlər. Şəhid Sani (r.ə.) «Şərhi-Lümə» kitabında doqquz üzvün

[1] «Vəsailuş-şiə»; cild 24; səh. 154; hədis 1

haram olduğunu qeyd edir.[1] Şəhid Əvvəl (r.ə.) isə onların on beş ədəd olduğunu yazır.[2] Bu üzvlər aşağıdakılardır:

1. Qan. Allah-təala buyurur:

إِنَّمَا حَرَّمَ عَلَيْكُمُ الْمَيْتَةَ وَالدَّمَ وَلَحْمَ الْخِنْزِيرِ وَمَا أُهِلَّ بِهِ لِغَيْرِ اللَّهِ

***«Həqiqətən, (Allah) sizə ölmüş heyvanı, qanı, donuz ətini və (kəsilərkən başı üzərində) Allahdan başqasının adı çəkilmiş heyvanı haram etmişdir.»***[3]

Atıcı qanı olan heyvanların qanı haramdır. Heyvan kəsilərkən qanı normal miqdarda axdıqdan sonra onun ətində qalmış qan pakdır. Lakin o qanın yeyilməsi haramdır. Əlbəttə əti bişirdikdə həmin qan parçalanıb yox olur və onu yeməyin heç bir eybi yoxdur.

Atıcı qanı olmayan heyvanlara gəldikdə isə, əgər o, qurbağa və ya kərtənkələ kimi əti haram olan heyvandırsa, mübahisəsiz olaraq onun qanı haramdır. Yox, əgər balıq kimi əti halal heyvanın qanıdırsa, onun halal olması mübahisəlidir. Amma balıq öz qanı ilə birgə yeyilərsə, bu əməlin halal olması uzaq görüş deyildir.[4]

---

[1] «Şərhi-Lümə»; cild 3; səh. 220
[2] «Lümə»; səh. 238
[3] «Bəqərə» surəsi; 173-cü ayə
[4] Sistani «Minhacus-salihin» cild 3, məsələ 906

Əgər yumurtanın sarısında qan olarsa, ehtiyata əsasən nəcisliyinə hökm olunur və onun yeyilməsi haramdır. [1] *Ayətullah Sistani* bu məsələ barədə buyurur: “Yumurtanın içindəki qan pakdır. Lakin onun yeyilməsi haramdır. Qanı çıxardıqdan sonra onu yemək olar.” [2]

2. Dalaq. Bəzi hədislərdə Əmirəl-möminin Əli (ə)-ın dalağı yeməməyi əmr etdiyi qeyd olunur. Qəssablardan biri o həzrətə dalaq və ciyərin eyni şey olduğunu deyir. İmam (ə): «Yalan deyirsən. Mənə içində su olan iki qab gətirin!»- deyə buyurur. Qablar gətirildikdən sonra İmam (ə) əmr edərək deyir: «Ciyəri də, dalağı da ortasından parçalayın!» Sonra hər ikisinin suya qoyulmasını əmr edir. Ciyər qoyulmuş qabın suyu dəyişmir. Amma dalaq olan qabın suyu qan olur. [3] Əlavə olaraq, biologiya elminin indiki inkişaf səviyyəsində ciyər və dalağın eyniliyi haqqında danışmaq belə gülünc çıxardı.

3. Erkək heyvanın cinsiyyət üzvü.

4. Xayalar.

5. Dişi heyvanın cinsiyyət üzvü (xarici və daxili cinsi üzvlər).

6. Balalıq.

7. Öd kisəsi.

---

[1] Xorasani, «Tovzihul-məsail» məsələ 99

[2] Ayətullah Sistaninin rəsmi internet səhifəsi, sistani.org

[3] «Fiqhul-İmam Cəfəris-Sadiq» 4-cü cild; səh. 380

8. Sidik kisəsi.

9. Peyin ( bağırsaqdakı peyin qalıqları)

10. Saçuzadan (onurğa sütununun yan tərəflərində əzələlərin səthi ilə boyundan çanağa qədər uzanan qalın sarı vətər).

11. Onurğa beyni (Onurğa kanalında yerləşən və el arasında haram ilik adlanan yumşaq kütlə).

12. Heyvanın ətraf əzələlərində fındığa oxşar limfa düyünləri (farsca, duşul).

13. Əzgiləbənzər vəz, epifiz (baş beyində noxud şəkilli üzv).

14. Dırnaqların arasındakı kiçik rudiment – inkişafdan qalmış törəmə, çıxıntı (ərəbcə, zatul-əşace).

15. Gözün hədəqəsi (lat. *Iris – az. Qüzehli qişa*). Hədəqə dedikdə göz yuvasında sağ-sola hərəkət edən dairəşəkilli hissə - bəbəklə ətrafındakı rəngli dairə nəzərdə tutulur.

Bəzi üzvlər üçün haram hökmü ehtiyata əsasəndir. Məsələn, Ayətullah Xorasani zatul-əşace və saçuzadanın vacib ehtiyata əsasən, yeyilməsinin caiz olmadığını buyurur.[1]

Quşlara gəlincə, bu dediklərmizdən qan və füzlə (peyin), şübhəsiz, haramdır. Amma digər üzvlərdən hər hansı biri onlarda olarsa, onun yeyilməsi, ehtiyata əsasən, haramdır.

---

[1] «Tovzihul-məsail»; məsələ 2690

Həmçinin, ehtiyata əsasən, balığın qanından və füzləsindən də çəkinmək lazımdır.

Heyvanın böyrəklərini və ürək qapaqlarını yemək məkruhdur.

Əti halal olan heyvanların ətini insana zərər vermədiyi təqdirdə çiy halda yemək olar.[1] Bu şərtlə ki, ətin üzərində qan olmasın.

**Heyvan dərisi və sümüyü.** Heyvan başının dərisi, toyuq və digər quşların dərisi və həmçinin sərçə kimi kiçik quşların sümüyü, mübahisəsiz olaraq, halaldır. Amma bu dediklərimizdən qeyrilərində dəri və sümük insana zərər yetirmədiyi təqdirdə halaldır.[2]

**Diri heyvandan ayrılmış üzv.** Əgər heyvanın hər hansı bir üzvü, məsələn, quyruğu heyvan diri olduğu halda kəsilib heyvanın bədənindən ayrılarsa, həmin hissə nəcisdir və haramdır.

**Süd.** Əti haram hökmündə olan heyvanların südü haram, əti halal olan heyvanların südü isə halaldır.

*Ayətullah Sistani:* Vacib-ehtiyata əsasən insan südü içmək[3] olmaz. [4]

---

[1] Sistani «Minhacus-salihin» cild 3, məsələ 902
[2] Sistani «Minhacus-salihin» cild 3,məsələ 901
[3] Əlbəttə bu məsələ körpə uşağa aid deyildir.
[4] «Minhacus-salihin» cild 3, məsələ 905

*Ayətullah Xoyi, Xorasani və Təbrizi:* İnsan südü içmək halaldır.[1]

## HEYVAN BÖVLÜ (SİDİYİ)

Əti haram heyvanların bövlü mübahisəsiz olaraq haramdır. Əti halal heyvanların bövlü barədə isə fəqihlərin nəzərləri aşağıdakılardır:

*Ayətullah Xoyi və Ayətullah Təbrizi:* Dəvədən başqa, əti halal olan heyvanların bövlü vacib-ehtiyata əsasən, haramdır. Amma şəfa (sağalmaq) məqsədi ilə dəvə bövlünü içmək olar.[2]

*Ayətullah Vəhid Xorasani :* Əqva (ən güclü) nəzərə görə, əti halal olan heyvanların bövlü haramdır. Amma müalicə məqsədi ilə dəvə, inək və qoyunun bövlünü içmək olar. [3]

*Ayətullah Sistani:* Əti halal olanların, hətta, dəvənin də bövlü ehtiyata əsasən haramdır. Amma müalicə məqsədi ilə dəvə, inək və qoyunun bövlünü içməyin heç bir eybi yoxdur.[4]

---

[1] «Minhacus-salihin» cild 2(3); məsələ 1698

[2] «Minhacus-salihin» cild 2; məsələ 1698

[3] «Minhacus-salihin» cild 3; məsələ 1698; 1140 və 1141-ci qeydlər

[4] «Minhacus-salihin» cild 3, məsələ 903

## HAQQ ƏHLİNƏ ATILMIŞ BÖHTAN

Qəlbi mərəz olan insanların biz şiələrə qarşı atdıqları çirkin böhtanlardan biri də budur ki, guya, şiə alimləri imamların (ə.s.) sidiyini içməyi və nəcisini yeməyi caiz bilirlər. Halbuki, heç bir şiə fəqihi bu əməli caiz bilməmişdir və bilməməkdədir. Bu barədə Ayətullah Seyyid Sistaninin sözünü qeyd etməklə kifayətlənirik. Cənab Seyyid Sistani bu məsələ barədə verilmiş sualın cavabında buyurur:

هذا كذب وافتراء نعوذ بالله منه

**«Bu yalan və iftiradır. Bundan Allaha pənah aparırıq.»**[1]

## SÜRÜNƏNLƏR VƏ HƏŞƏRATLAR

Həşərat yemək insan təbiətinin iyrəndiyi bir şeydir. Allah-təala buyurur:

وَيُحَرِّمُ عَلَيْهِمُ الْخَبَائِثَ

***«…(O Peyğəmbər) çirkin və murdarları (insanlara) haram edər.»*** [2]

---

1 «İstiftaat» səh. 554

2 «Əraf» surəsi; ayə 157

Buna görə də fəqihlər həşəratların haram olduğunu buyururlar. Düzdür bəzi fəqihlər heç də bütün həşəratların haram olması fikrində deyillər. Məsələn, Muhəmməd Cəvad Muğniyyə «Fiqhul-İmam Cəfəris-Sadiq» kitabında yazır: «Həşəratların haram olması haqqında ümumi mənada dəlil yoxdur. Onlardan zəhərli olanları insan həyatı üçün təhlükəli olduqları üçün haramdır. Qalanları isə İmam Cəfər Sadiqin (ə) buyurduğu "Haram olduğunu bilmədiyin bütün şeylər sənə halaldır" qanununa daxildir.» [1] Lakin kitabımızda fətvalarını qeyd etdiyimiz müasir mərcəi-təqlid müctəhidlər həşəratların haram olması fikrindədirlər.

Çəyirtkənin yeyilməsi isə halaldır, çünki bu barədə dəlil vardır. İmam Sadiq (ə) buyurur:

**لا بأس بأكل الجراد**

**« Çəyirtkə yeyilməsinin heç bir eybi yoxdur.»** [2]

Məsumlardan (ə) nəql olunmuş hədislərə əsasən, fəqihlər ilan, kərtənkələ və digər sürünənlərin də haram olduğunu buyururlar.

---

[1] «Fiqhul-İmam Cəfəris-Sadiq» 4-cü cild; səh. 370

[2] «Tuhəful-Uqul» səh 246

## MURDAR OLMUŞ HEYVAN

Nəss (ayə və hədislər) və icmaya (alimlərin ittifaqına) əsasən [1] murdar olmuş heyvanın ətini yemək haramdır. Allah-Təala buyurur:

حُرِّمَتْ عَلَيْكُمُ الْمَيْتَةُ

***« Ölü heyvan (kəsilmədən murdar olmuş) sizə haram oldu.»*** [2]

Atıcı qanı olan əti halal heyvan kəsilmədən öz-özünə ölsə, və yaxud qeyri-şəri yolla kəsilsə nəcis və onun yeyilməsi haramdır. Balığın atıcı qanı olmadığına görə suda ölsə pak, lakin suda öldüyünə görə onun yeyilməsi haramdır.

Murdar olmuş heyvanın bəzi üzvlərindən istifadə etmək halaldır: Onlar yun, tük, lələk, buynuz, dırnaq, sümük və diş kimi ruh daxil olmayan hissələrdir. Bu hökmə həmçinin süd, [3] üzərinə qabıq gəlmiş (bərkimiş) yumurta və südəmər çəpişin (və ya quzunun) qursağında olan pendir mayası da daxildir. Ehtiyata əsasən, həmin yumurtanın və qursaqdakı mayanın üzü yuyulmalıdır.

İmam Cəfər Sadiq (ə) buyurur:

---

[1] «Fiqhul-İmam Cəfəris-Sadiq» 4-cü cild; səh. 378
[2] «Maidə» surəsi; ayə 3
[3] Ayətullah Sistani «Minhacus-salihin» cild 3, məsələ 907

عشرة أشياء من الميتة ذكية : القرن والحافر والعظم والسن والإنفحة واللبن والشعر والصوف والريش والبيض

**«Murdar olmuş heyvanın on üzvü pakdır: buynuz, dırnaq, sümük, diş, qursaqdakı maya, süd, tük, yun, lələk və yumurta.»**[1]

## MƏSƏLƏ

Əgər insan ölmüş bir heyvanın murdar olub-olmamasında şəkk edirsə, onun ətindən çəkinməsi vacibdir. Əgər (halal və ya haram olduğunu bilmədiyi) həmin əti müsəlmandan alarsa, onu yemək olar.

---

[1] «Fiqhul-İmam Cəfəris-Sadiq» 4-cü cild; səh. 378

## II FƏSİL
## QEYRİ-HEYVANİ QİDALAR

### NƏCİS ŞEYLƏR

Şəri cəhətdən nəcis ( napak, murdar) sayılan hər bir şeyin yeyilməsi haramdır. Həmin nəcis şeylər müctəhidlərin «Tovzihul-məsail» risalələrinin «təharət» bölməsində geniş şəkildə izah edilmişdir. Həmçinin nəcis olmuş (mütənəccis) şeyləri də yemək haramdır. Məsələn, əhli-kitab[1] (yəhudi, xristian) olmayan bir kafir əlini yaş halda çörəyə vurarsa və əlindəki nəmlik[2] çörəyə keçərsə hətta çörək qurusa belə, onu yemək haramdır.

### MƏSƏLƏLƏR

1. Kafirin hazırladığı təamı (xörəyi, yeməyi) müsəlmanın yeməsi caizdir. Amma bu şərtlə ki, yeməyin içərisində ət və ət məhsulları[3] olmasın[4] və yeməyə şərab kimi haram şeylərin qatıldığını müsəlman şəxs bilməsin. Digər bir şərt bundan ibarətdir ki, əgər kafir əhli-kitab (yəhudi, xristian)

---

[1] Əhli-kitabın nəcis olub-olmamağı barədə fəqihlərin rəyi müxtəlifdir. Biz məsələləri əhli-kitabın pak olduğu təqdirə əsasən cəm etmişik.
[2] Çünki nəcis nəmlik vasitəsilə bir cismdən digərinə keçir.
[3] Balıq və balıq məhsullarının hökmü "balıq ovu" məsələlərində qeyd olundu.
[4] Əlbəttə əgər kafir əti müsəlmandan alarsa halaldır. Onu yemək olar.

deyilsə, müsəlman onun əlindən yeməyə rütubət keçdiyini bilmirsə, həmin təamdan yeyə bilər. Əks halda isə haramdır.

2. Kafirin əlindən yeməyə rütubətin keçib-keçmədiyini araşdırmaq yaxud həmin kafirin özündən soruşmaq vacib deyildir.

3. Əgər əhli-kitabdan olub-olmadığı bilinməyən bir kafir yemək bişirərsə və onun əlinin yaş halda yeməyə toxunduğu məlum olarsa, onun bişirdiyi yeməkdən yemək caizdir. Həmçinin, ondan əqidəsini soruşmaq vacib deyildir.

4. Ev sahibi yemək zamanı yeməyin nəcis olduğunu başa düşsə, bunu qonaqlara deməlidir. Amma qonaqlardan biri yeməyin nəcis olduğunu başa düşsə, digərlərinə deməsi lazım deyildir. Əgər deməyəcəyi təqdirdə özü də o yeməkdən yeməyə məcbur olacaqsa, gərək desin.

5. Əgər donmuş yağ kimi bərk bir cismin üzərinə nəcis (məsələn, qan) düşsə, həmin nəcis və onun rütubət vasitəsilə sirayət etdiyi hissə yağın üzərindən götürülməlidir. Qalan hissənin yeyilməsi isə halaldır. Üzərinə nəcis düşmüş qatı mayelər (məs: bal kimi) də bərk cisimlərin hökmündədir. Yəni nəcisi və onun sirayət etdiyi yerləri aradan aparmaqla qalan hissə pak və halal olar. Qeyd edilməlidir ki, həmin mayenin üzərindən bir qədər götürüldükdən sonra yerinin dərhal deyil, tədricən dolması şərtdir.

6. Üzərindən bir miqdar götürüldükdə yeri dərhal dolan mayelərə isə zərrə qədər nəcis düşdükdə həmin maye bütünlüklə nəcis olar. Məsələn, maye halında olan bitki yağına iynə ucu qədər qan düşərsə, yağın hamısı nəcis olar. Həmin yağın yeyilməsi də haramdır.

## PALÇIQ VƏ TORPAQ

Məsumlardan (ə) nəql olunmuş bir çox hədislərdə palçıq yeməyin haram olduğu qeyd olunur. Allah Rəsulu (s) buyurur:

من اكل الطين فهو ملعون

**«Palçıq yeyən şəxs lənətlənmişdir.»**[1]

İmam Rza (ə) buyurur:

اكل الطين حرام مثل الميتة والدم ولحم الخنزير

**«Palçıq yemək leş, qan və donuz əti yemək kimi haramdır.»**[2]

Palçığın qurumuş halı da haram hökmünə daxildir. Ehtiyat-vacibə [3] əsasən, qum və torpaq yemək də haramdır.

---

[1] «Vəsailuş-şiə»; cild 24, səh 225, hədis 15
[2] «Vəsailuş-şiə»; cild 24, səh 224, hədis 11
[3] Sistani «Tovzihul-məsail»; məsələ 2637

## MƏSƏLƏ

Meyvə, tərəvəz və s. qidaların üzəri az miqdarda torpağa və ya palçığa bulaşarsa, onu yeməyin eybi yoxdur. Əlbəttə, bu halda meyvənin üzərindəki torpaq o qədər az olmalıdır ki, kənardan baxan: "torpaq yox, meyvə yeyir" - deyə bilsin.

## İMAM HÜSEYN (Ə) TÜRBƏTİ

Şəhidlər ağası İmam Hüseynin (ə) qəbrinin torpağı haram hökmünə daxil deyildir. Əksinə hədislərdə İmam Hüseyn (ə) türbətinin hər cür dərdə şəfa olması nəql olunmuşdur. Bu barədə nəql olunmuş hədislərin birində İmam Sadiq (ə) buyurur:

**اكل الطين حرام علي بني آدم ، ما خلا طين قبر الحسين ( عليه السلام ) ، من اكله من وجع شفاه الله**

**«Adəm övladına Hüseynin (ə) qəbrinin torpağından başqa, torpaqları yemək haramdır. Hər kim ağrılarına görə, ondan (o qəbrin torpağından) yesə, Allah ona şəfa verər.»**[1]

Lakin qeyd etmək lazımdır ki, İmamın (ə) türbətindən bir noxud miqdarından çox yemək caiz deyildir. İmam Sadiq (ə) buyurur:

---

[1] «Vəsailuş-şiə»; cild 24, səh 228, hədis 4

ولا تناول منها اكثر من حمصة ، فان من تناول منها اكثر من ذلك فكانما اكل من لحومنا ودمائنا

**«(Hüseynin (ə) türbətindən) bir noxud qədərindən artıq yemə. Hər kim bundan artığını yesə, sanki bizim ətimizi və qanımızı yemişdir.»**[1]

Həmçinin qeyd etməliyik ki, İmam Hüseyn (ə) türbətini yalnız şəfa məqsədi ilə yemək olar.  İmam Sadiq (ə) bu barədə belə buyurur:

ومن اكله بشهوة لم يكن له فيه شفاء

**«Kim onu (İmam Hüseyn (ə) türbətini) şəhvətlə (yəni şəfa tapmaq üçün yox, torpaq yeməyə olan həvəsini öldürmək üçün) yeyərsə, o torpaqdan ona şəfa gəlməz.»**[2]

Daha yaxşı olar ki, türbəti bir miqdar suda qarışdırıb həll etdikdən sonra onun suyu içilsin. Həmin su içilərkən bu duanın oxunması hədislərdə nəql olunmuşdur:

اللهم اني اسألك بحق الملك الذي قبضها و أسألك بحق النبي الذي خزنها واسالك بحق الوصي الذي حل فيها ان تصلي على

---

1 «Vəsailuş-şiə»; cild 24; səh 229, hədis 7

2 «Vəsailuş-şiə»; cild 24; səh 226, hədis 1

محمد وآل محمد وان تجعلها لي شفاء من كل داء وامانا من كل خوف وحفظا من كل سوء

**Duanın oxunuşu:** *Allahumə inni əs`əlukə bihəqqi mələkil-ləzi qəbəzəha və əs`əlukə bihəqqin-nəbiyyil-ləzi xəzənaha və əs`əlukə bihəqqil-vəsiyyil-ləzi həllə fiha ən tusəlliyə əla Muhəmmədin və Ali Muhəmməd və ən təc`ələha lii şifaaun min kulli daain və əmanən min kulli xovfin və hifzən min kulli suuin.*

**Duanın tərcüməsi:** *İlahi, səni torpağı (Kərbəla torpağını) gətirən mələyə, onu saxlayan Peyğəmbərə və orada məskən salmış Vəsinin*[1] *haqqına and verib istəyirəm ki, Muhəmməd və ali Muhəmmədə rəhmət və bərəkət nazil edəsən. Bu torpağı hər bir xəstəliyim üçün şəfa, hər bir qorxudan aman və hər bir pislikdən qorunma qərar verəsən.*

## ZƏRƏRLİ QİDALAR

İnsan səhhətinə ciddi şəkildə və nəzərə çarpacaq dərəcədə böyük ziyan vuran hər bir şeyi yemək haramdır. Allah-Təala buyurur:

---

[1] Bu duada qeyd olunmuş torpağı gətirən mələkdən məqsəd hz. Cəbrail (ə), onu saxlayan Peyğəmbərdən məqsəd isə hz. Muhəmməd (s)-dir. Mötəbər hədislərdə nəql olunalara əsasən bir gün hz. Cəbrail (ə) Kərbəla torpağını hz. Peyğəmbər (s) üçün gətirmiş, hz. Peyğəmbər (s) də həmin torpağı bir qabın içərisində saxlamışdır.
Orada məskən salmış vəsidən məqsəd isə hz. Əmirəl-möminin Əli (ə)-dır.

وَلَا تُلْقُوا بِأَيْدِيكُمْ إِلَى التَّهْلُكَةِ

***«Öz əllərinizlə özünüzü təhlükəyə atmayın.»***[1]

İmam Sadiq (ə) buyurur:

وما كان فيه المضرة على الانسان في أكله فحرام أكله

**« İnsana zərəri olan şeyləri yemək haramdır.»**[2]

Qeyd etdiklərimizdən məlum olur ki, insana zərər verən və onun həyatını təhlükə altına atan zəhərli qidalar haramdır. Həmçinin, insan həyatı üçün təhlükəsi olmayan, amma onun hər hansı bir üzvünün şikəst olmasına (məsələn, gözünün kor olmasına) səbəb olan qidalar da haramdır.

## SİQARET

Nə Qurani-Kərimdə, nə də sünnədə siqaret haqqında xüsusi bir dəlil qeyd olunmamışdır. Yəni məhz siqaretin haramlığı haqqında hər hansı bir ayə və yaxud hədis yoxdur. Ona görə də siqaretin hökmü ümumi olaraq zərər hökmünə qayıdır. Buna görə də mərcəi-təqlid müctehidlər Quran və hədislərdə zikr olunmuş ümumi zərər qanunundan istifadə edərək siqaretin caiz olub-olmamasına dair verilmiş suallara bu cür cavab verirlər:

---

1 «Bəqərə» 195
2 «Vəsailuş-şiə»; cild 25, səh. 84, hədis 1

*Ayətullah Təbrizi*: Yaxşı iş deyil. Yaxşı olar ki, tərk olunsun.[1]

*Ayətullah Sistani*: Əgər bir kəs siqaretin onun üçün ölüm və ya ölümə yaxın kimi aşkar mühüm zərəri olduğunu bilərsə, onu çəkməsi caiz deyildir. Əks təqdirdə isə siqaret çəkmək zatən haram deyil. Amma yaxşı olar ki, bu əməli tərk etsin.[2]

*Ayətullah Vəhid Xorasani*: Əgər etina ediləsi ciddi bir zərəri olarsa, caiz deyil.[3]

## HARAM İÇKİLƏR, ŞƏRAB

Müqəddəs İslam şəriətinə əsasən şərab içmək haramdır və böyük günahdır. Şərabdan məqsəd bütün məstedici içkilərdir. Əgər hər hansı bir içkidə məstedicilik varsa, o şərab hökmündədir və içilməsi mütləq şəkildə haramdır. Bəzi insanlar belə fikirləşirlər ki, şərabı məst edən miqdarda içmək haram, bundan az miqdarda içmək isə halaldır. Onların bu sözləri etdikləri çirkin və qəbih əmələ bəraət qazandırmaqdan başqa bir şey deyildir. İmam Sadiq (ə) buyurur:

---

[1] Məsaili-cədid, 1-ci cild, səh. 147

[2] www.alseraj.net «Kənzul-fətava» sual 109

[3] www.vahid-khorasani.ir

فما لم يغير العقل كثيره فلا بأس بشربه وكل شئ يغير منها العقل كثيره فالقليل منه حرام

**«İçkilərdən çox içildiyi halda ağıla təsir etməyəni (yəni insanı məst etməyəni) halaldır. Lakin çox içildiyi halda ağlı aradan aparırsa, ondan az miqdarda belə içmək haramdır.»** [1]

Deməli, istər çox olsun, istərsə də az, şərab içmək mütləq şəkildə haramdır. Bəziləri cahilliklərindən Qurani-Kərimdə şərabın haram edilmədiyini iddia edirlər. Halbuki, Quran ayələrində şərabın haram olmasına dair kifayət qədər dəlillər mövcuddur:

يَسْأَلُونَكَ عَنِ الْخَمْرِ وَالْمَيْسِرِ ۖ قُلْ فِيهِمَا إِثْمٌ كَبِيرٌ

***«Səndən xəmr (sərxoşedici içki) və qumar barəsində soruşurlar. De: İkisində də böyük günah vardır.»*** [2]

يَا أَيُّهَا الَّذِينَ آمَنُوا إِنَّمَا الْخَمْرُ وَالْمَيْسِرُ وَالْأَنْصَابُ وَالْأَزْلَامُ رِجْسٌ مِنْ عَمَلِ الشَّيْطَانِ فَاجْتَنِبُوهُ لَعَلَّكُمْ تُفْلِحُونَ

***«Ey iman gətirənlər! Şərab da (içki də), qumar da, bütlər də, fal oxları da Şeytan əməlindən olan murdar bir şeydir. Bunlardan çəkinin ki, bəlkə, nicat tapasınız!»*** [1]

---

[1] «Vəsailuş-şiə»; cild 25, səh. 85, hədis 1
[2] «Bəqərə» 219

إِنَّمَا يُرِيدُ الشَّيْطَانُ أَنْ يُوقِعَ بَيْنَكُمُ الْعَدَاوَةَ وَالْبَغْضَاءَ فِي الْخَمْرِ وَالْمَيْسِرِ وَيَصُدَّكُمْ عَنْ ذِكْرِ اللَّهِ وَعَنِ الصَّلَاةِ ۖ فَهَلْ أَنْتُمْ مُنْتَهُونَ

***«Şübhəsiz ki, Şeytan şərab (sərxoşedici içki) və qumarla aranıza ədavət və kin salmaq, sizi Allahın zikrindən və namaz qılmaqdan ayırmaq istər. Artıq bu işə son qoyacaqsınızmı?»***[2]

Gördüyünüz kimi qeyd etdiyimiz birinci ayədə şərab içməyin böyük günah olduğu buyurulur. Məlumdur ki, günah haram bir işin müqabilində olar. Yəni əgər şərab içmək günah və günah iş görmək haramdırsa, deməli, şərab içmək də haramdır. Həmçinin murdar və şeytan əməlindən olan bir şey, şübhəsiz ki, haramdır.

Allahın Rəsulu (s) buyurur:

جمع الشر كله في بيت و جعل مفاتحه شرب الخمر

**«Bütün şərlər bir evdə cəm edilmişdir. Şərab içmək isə həmin evin açarıdır.»**[3]

Başqa bir hədisdə isə Peyğəmbərimiz (s) bu cür buyurur:

الخمر ام الفواحش و الكبائر

---

[1] «Maidə» 90

[2] «Maidə» 91

[3] «Mizanul-Hikmət» cild 1; səh.813

**«Şərab bütün pozğunluqların və bütün böyük günahların anasıdır.»**[1]

Məsumlardan (ə) nəql olunan hədislərdə şərab içilən süfrədə (insanın özü şərab içməsə də) yeyib-içmək və hətta, o süfrə arxasında əyləşmək qadağan olunmuşdur. Belə ki, Peyğəmbərimiz (s) buyurur:

**من كان يؤمن بلله و اليوم الآخر فلا يجلس على مائدة يشرب عليها الخمر**

**«Allaha və axirət gününə iman gətirmiş kəs, şərab içilən süfrədə əyləşməz.»**[2]

Bu və bu kimi hədislərə istinad edərək fəqihlər şərab içilən süfrədə yeyib-içməyi və o süfrə arxasında əyləşməyi haram buyururlar. Amma şərab verilən restoran və kafelərdə içki olmayan süfrədə oturmaq və halal təamlardan yemək caizdir.[3]

## PİVƏ

Pivənin haram olmasında heç bir şəkk-şübhə yoxdur. İmam Rzadan (ə) pivə haqqında soruşulduqda İmam (ə) bu cür buyurmuşdur:

**لا تقربه فانه من الخمر**

---

[1] «Mizanul-Hikmət» cild 1; səh.812

[2] «Mizanul-Hikmət» cild 1; səh.813

[3] Sistani «Kənzul-fətava» "ətimə və əşribə" sual 3, www.alseraj.net

**«Ona yaxın durma. O, şərabdan (məst edici içkilərdən) sayılır.»**[1]

Pivənin məstediciliyi (alkoqolluq faizi) insanı çox məst etməyəcək dərəcədə az olsa belə, onun içilməsi haramdır. Həmçinin ehtiyata əsasən adı pivə olan hər bir içkidən (spirtsiz olsa belə) çəkinmək lazımdır.[2]

**Kvasın** içilməsi isə halaldır.

## ÜZÜM ŞİRƏSİ

Əgər üzüm və onun şirəsi (suyu) öz-özünə və ya od vasitəsilə qaynayarsa və qaynamaqla 2/3 hissəsi aradan getməzsə, onun içilməsi haramdır. Amma əgər 2/3 hissəsi aradan gedib 1/3 hissəsi qalarsa, onun içilməsi caizdir. İmam Cəfər Sadiq (ə) bu barədə buyurur:

**اذا تغير عن حاله و غلى فلا خير فيه حتى يذهب ثلثاه و يبقى ثلثه**

**«Əgər olduğu halından dəyişib qaynayarsa, üçdə ikisi gedib üçdə biri qalana qədər onda (onun içilməsində) heç bir xeyir yoxdur.»**[3]

Başqa bir hədisdə isə İmam Sadiq (ə) buyurur:

---

[1] «Vəsailuş-şiə»; əşribətul-muhərrəmə; bab 27; hədis 6

[2] Ayətullah Təbrizi «Fiqhul-muğtərib»; səh.172

[3] «Vəsailuş-şiə»; əşribətul-muhərrəmə; bab 2; hədis 6

من شرب العصير فكأنما شرب الخمر

**«(Qaynamış, lakin üçdə ikisi aradan getməmiş) üzüm şirəsi içən şəxs şərab içmiş kimidir.»** [1]

Deməli, üzüm kompotu hazırlamaq istədikdə su ayrılıqda qaynadıldıqdan sonra üzümün üzərinə tökülərsə onun içilməsi halaldır. Yox əgər üzümün üzərinə su töküb, sonra suda qaynadılsa, həmin kompot haram olar. Çünki bu cür qaynamaqla onun üçdə iki hissəsi aradan getməz. Həmçinin, üzüm mürəbbəsi də bu cürdür. Əgər qaynamaqla üçdə iki hissəsi aradan getməmişsə, həmin mürəbbəni yemək haramdır.

Amma kişmiş qaynamaqla haram olmaz. Yəni kişmiş qaynasa və üçdə ikisi aradan getməsə belə, onun içilməsi caizdir.

## BAŞQASININ MALINDAN YEMƏK

Sahibinin (istər kafir olsun, istər müsəlman) izni olmadan hər hansı bir qidanı qəbul etmək caiz deyildir. Lakin fəqihlər bu məsələdən iki halı istisna edirlər. Birincisi, aşağıdakı ayədə adları çəkilənlərin evlərində iznsiz olaraq təam yemək caizdir.

---

[1] Şeyx Ənsari «Fəraidul-usul» cild 1, səh.130

وَلَا عَلَىٰ أَنْفُسِكُمْ أَنْ تَأْكُلُوا مِنْ بُيُوتِكُمْ أَوْ بُيُوتِ آبَائِكُمْ أَوْ بُيُوتِ أُمَّهَاتِكُمْ أَوْ بُيُوتِ إِخْوَانِكُمْ أَوْ بُيُوتِ أَخَوَاتِكُمْ أَوْ بُيُوتِ أَعْمَامِكُمْ أَوْ بُيُوتِ عَمَّاتِكُمْ أَوْ بُيُوتِ أَخْوَالِكُمْ أَوْ بُيُوتِ خَالَاتِكُمْ أَوْ مَا مَلَكْتُمْ مَفَاتِحَهُ أَوْ صَدِيقِكُمْ ۚ لَيْسَ عَلَيْكُمْ جُنَاحٌ أَنْ تَأْكُلُوا جَمِيعًا أَوْ أَشْتَاتًا

***«Sizin özünüzə də öz evlərinizdə, yaxud atalarınızın evlərində, yaxud analarınızın evlərində, yaxud qardaşlarınızın evlərində, yaxud bacılarınızın evlərində, yaxud əmilərinizin evlərində, yaxud bibilərinizin evlərində, yaxud dayılarınızın evlərində, yaxud xalalarınızın evlərində, yaxud açarları əllərinizdə olan (səlahiyyətiniz çatan) evlərdə, yaxud dostlarınızın evlərində yemək yeməkdən heç bir günah gəlməz. Bir yerdə, yaxud ayrı-ayrılıqda yeməyinizdə də heç bir günah yoxdur.»***[1]

Deməli, ayədə sadalanan şəxslərin evlərində sahibinin icazəsi olmadan təam yemək olar. Bu şərtlə ki, həmin təam ev sahiblərinin adəti üzrə gündəlik yedikləri təamlardan olsun. Lakin ev sahibinin həmişə yeyə bilmədiyi və ya ziyafət üçün saxladığı təamı icazəsiz yemək caiz deyildir.

[1] «Nur» 61

Həmçinin, əgər həmin şəxslər, ümumiyyətlə, öz evlərində yeməyə icazə verməsələr, icazəsiz olaraq o yeməklərdən istifadə etmək haramdır.

Fəqihlərin istisna etdiyi ikinci hal isə budur ki, bir şəxs başqasına məxsus olan meyvə ağacının yanından keçərkən, onun meyvəsindən yeyə bilər. Lakin bunun bir neçə şərti vardır:

1. Meyvə yeməklə həmin ağaca ziyan vurmamalıdır. Burada ziyan vurmaqdan məqsəd nəzərə çarpacaq dərəcədə çox yeməkdir.

2. Ağac olan yoldan meyvə yemək məqsədi ilə keçməməlidir.

3. Ağac şəxsin keçdiyi yola yaxın olmalıdır.

4. Ağac sahibinin narazı olduğunu güman etməməlidir.

Yuxarıdakı şərtlərdən biri mövcud olmazsa sahibinin icazəsi olmadan həmin ağacın meyvəsindən yemək caiz deyildir.

Şəhid Sani (r.ə.) «Şərhi-Lümə» kitabında bu əməlin tərk olunmasının daha yaxşı olduğunu qeyd edərək səbəbini bu cür izah edir:

«...Çünki (meyvəni yeməyin halal və ya haram olması) barədə alimlər arasında fikir ayrılığı vardır. Həmçinin, bu əməli qadağan edən hədis də nəql olunmuşdur...»[1]

---

[1] «Şərhi-Lümə» 2-ci cild; səh. 73

**Məsələ.** Fərz edək ki, qonşunun həyətindəki ağacdan digər qonşunun həyətinə meyvə düşür. Ağac sahibinin icazəsi olmadan qonşu o meyvədən yeyə bilərmi?

Cavab: Bu halda ağac sahibinin razılığı olmalıdır. Həyətinə meyvə düşmüş şəxs ya ağacın sahibindən icazə almalı,[1] ya da meyvənin yeyilməsinə onun razı olduğunu bilməlidir.

## XÜMSÜ VERİLMƏMİŞ MALDAN YEMƏK

Xümsü verilməmiş maldan yemək olarmı? Bu halda bizim vəzifəmiz nədir? Bu barədə müctəhidlərin fikirləri bir qədər müxtəlif olduğundan onları ayrı-ayrılıqda sizin nəzərinizə çatdırırıq.

*Ayətullah Xoyi, Təbrizi, Sistani:* Xümsə ev sahibi cavabdehdir. Qonaqlar o yeməkdən yeyə bilərlər.[2]

*Ayətullah Vəhid Xorasani:* Əgər qonaqlar yeməyin xümsünün verilmədiyini yəqin bilsələr, ondan yeyə bilməzlər (yemək verən şəxsin xümsə əqidəsi yoxdursa, bu hal istisnadır). Xümsün verilib-verilmədiyində şəkk etdikdə də, vacib-ehtiyata əsasən, o yeməkdən yeməməlidirlər.[3]

**Qeyd:** Möminlər qonaqlıqda olarkən onlara verilən yeməklərin xümsünün verilib-verilməməsini soruşmaları

---

[1] Ayətullah Sistani «Kənzul-fətava» sual 195; www.alseraj.net
[2] «Tovzihul-məsail»; məsələ 1803
[3] «Tovzihul-məsail»; məsələ 1812

vacib deyildir. Yəni bu barədə axtarış aparmalarına ehtiyac yoxdur. [1]

## MƏCBURİ HALLAR

«Fiqh» elmində belə bir qanun var: «Məcburi hallar, haramları halal edir.» Yəni insan məcburiyyət qarşısında qaldıqda ona haram olan əməli icra edə bilər. Buna müqəddəs kitabımız «Qurani-Kərimdən» çoxsaylı ayələri dəlil olaraq göstərmək olar. Allah Təala buyurur:

وَمَا جَعَلَ عَلَيْكُمْ فِي الدِّينِ مِنْ حَرَجٍ

***«(Allah) bu dində də sizin üçün heç bir çətinlik yaratmadı.»*** [2]

يُرِيدُ اللَّهُ بِكُمُ الْيُسْرَ وَلَا يُرِيدُ بِكُمُ الْعُسر

***«Allah sizin üçün çətinlik deyil, asanlıq istəyir.»*** [3]

يُرِيدُ اللَّهُ أَنْ يُخَفِّفَ عَنْكُمْ ۚ وَخُلِقَ الْإِنْسَانُ ضَعِيفًا

***«Allah istər ki, üzərinizdə olanı (ağırlığı) yüngülləşdirsin, çünki insan (şəhvətini cilovlamaq və itaətin çətinliyinə dözmək baxımından) zəif yaradılmışdır.»*** [4]

---

1 Ayətullah Vəhid Xorasani, katiblik
2 «Həcc» 78
3 «Bəqərə» 185
4 «Nisa» 28

فَمَنِ اضْطُرَّ غَيْرَ بَاغٍ وَلَا عَادٍ فَإِنَّ رَبَّكَ غَفُورٌ رَحِيمٌ

***«Hər kəs məcburiyyət qarşısında qalsa, həddi aşmadan, zəruri ehtiyacını ödəyəcək qədər (bunlardan yesə, Allah ona cəza verməz)". Çünki sənin Rəbbin, həqiqətən, bağışlayandır, rəhm edəndir!»*** [1]

وَقَدْ فَصَّلَ لَكُمْ مَا حَرَّمَ عَلَيْكُمْ إِلَّا مَا اضْطُرِرْتُمْ إِلَيْهِ

***«Halbuki məcburiyyət qarşısında (yeməli) olduğunuz şeylər istisna edilməklə, sizə haram buyurduqlarını artıq O (Allah) müfəssəl şəkildə sizə bildirmişdir.»*** [2]

إِنَّمَا حَرَّمَ عَلَيْكُمُ الْمَيْتَةَ وَالدَّمَ وَلَحْمَ الْخِنْزِيرِ وَمَا أُهِلَّ بِهِ لِغَيْرِ اللَّهِ ۖ فَمَنِ اضْطُرَّ غَيْرَ بَاغٍ وَلَا عَادٍ فَلَا إِثْمَ عَلَيْهِ ۚ إِنَّ اللَّهَ غَفُورٌ رَحِيمٌ

***«O (Allah) sizə ölmüş heyvanı, qanı, donuz ətini və Allahdan başqasının adı ilə (bütlərin və s. adı ilə) kəsilənləri (yeməyi) qəti haram etmişdir. Lakin naəlac qaldıqda (başqasının malını) zorla mənimsəmədən və həddi aşmadan (zəruri ehtiyacı ödəyənə qədər) bunlardan yeməyə məcbur olan kimsənin heç bir günahı yoxdur. Allah bağışlayandır, mərhəmətlidir!»*** [3]

---

[1] «Ənam» 145
[2] «Ənam» 119
[3] «Bəqərə» 173

Deməli, insan məcburiyyət qarşısında qaldıqda yeyilməsi haram olan qidalardan lazımı miqdarda, həddi aşmadan yeyə bilər. Bu ona günah sayılmaz. Bəs, görəsən, məcburi hal deyildikdə nə nəzərdə tutulur? Məcburi haldan məqsəd nədir?

## MƏCBURİYYƏTİN (ZƏRURƏTİN) MƏNASI

Fəqihlər buyurur: «Məcburi hal odur ki, insan haram olan bir işi icra etməsə aşağıdakı hallardan biri baş verə bilər:

a) Həyatı və sağlamlığı təhlükə qarşısında qalar;

b) Şiddətli xəstəlik baş verər;

c) Xəstəliyi daha da şiddətlənər;

d) Malını itirmək təhlükəsi yaranar;

e) Başqa birinin həyatı və sağlamlığı təhlükə altına atılar. Məsələn, hamilə bir qadın uşağını itirmək təhlükəsi qarşısında qalar, və ya "şərab içməsən, filankəsi öldürəcəyəm" deyə insanı təhdid edərlər.» [1] Lakin "filankəsi öldürməsən, səni öldürəcəyik" deyilsə, bu hal fiqh elminin qəsd etdiyi məcburiyyət halına daxil deyildir. Yəni bu halda insan öz canını qorumaq üçün başqasını öldürə bilməz.

Qeyd etmək lazımdır ki, insan məcburiyyət qarşısında qaldıqda haramdan istifadə etməkdə həddini aşmamalıdır.

---

[1] «Fiqhul-İmam Cəfəris-Sadiq»; 4-cü cild; səh 390

Yəni məcburi halı aradan qaldıracaq miqdardan artıq haramdan istifadə etmək caiz deyildir.

## MƏSƏLƏLƏR

1. Fərz edək ki, bir nəfər donuz əti yeməsə, adətən dözülməz dərəcədə şiddətli bir xəstəliyə düçar olacaq. Bunu bilə-bilə o, donuz ətini yeməkdən imtina edir və həmin xəstəliyə tutulur. Görəsən, bu halda həmin şəxs günah etmişdirmi? Muhəmməd Cəvad Muğniyyə «Fiqhul-İmam Cəfəris-Sadiq» kitabında həmin şəxsin günah etdiyini və ***«Öz əllərinizlə özünüzü təhlükəyə atmayın.»***[1] ayəsinə qarşı çıxdığını qeyd edir.[2]

2. Hər bir müsəlmana vacibdir ki, aclıq və susuzluğa görə ölüm ayağında olan bir müsəlmana çörək və su verməklə onu ölümdən xilas etsin.

## HARAMLA MÜALİCƏ

Tez-tez sual verirlər ki, yeyilməsi və ya içilməsi haram olan qidalardan müalicə məqsədi ilə istifadə etmək olarmı?

Cavab**:** Yeyilməsi və ya içilməsi haram olan qidalardan müalicə məqsədi ilə yalnız o vaxt istifadə etmək olar ki, xəstəlik adətən dözülməz dərəcədə şiddətli olsun[3] və onun

---

[1] «Bəqərə»; 195
[2] «Fiqhul-İmam Cəfəris-Sadiq»; 4-cü cild; səh 391
[3] Ayətullah Sistani «Minhacus-salihin» cild 3; məsələ 948

müalicəsi yalnız həmin haram qida ilə mümkün olsun. Əks təqdirdə isə haramla müalicəyə icazə verilmir.

## ŞƏRABLA MÜALİCƏ

Bəzi fəqihlər məcburiyyət qarşısında qaldıqda belə şərabla müalicənin caiz olmadığını buyururlar. Amma Muhəmməd Cavad Muğniyyənin qeyd etdiyinə əsasən, əksər fəqihlər müalicənin yalnız şərabla mümkün olduğu təqdirdə bu əməli caiz bilirlər. [1] Əlbəttə yenə də qeyd etməliyik ki, xəstəlik gərək adətən dözülməz dərəcədə şiddətli bir xəstəlik olsun. Əks təqdirdə səbr edib Allahdan şəfa diləməlidir. Çünki bütün dərdlərin və xəstəliklərin dəvası həqiqətən də Onun əlindədir.

## QIZIL VƏ GÜMÜŞ QAB

Səhih bir hədisdə Muhəmməd ibn Muslim İmam Baqirin (ə) bu cür buyurduğunu nəql edir:

**لا تأكل في آنية ذهب ولا فضة**

**«Qızıl və gümüş qablarda yeməyin.»**[2]

Bu və bu kimi hədislərə əsasən, fəqihlər qızıl və gümüş qablarda yemək və içməyin haram olduğunu buyururlar.

1 «Fiqhul-İmam Cəfəris-Sadiq»; 4-cü cild; səh 392

2 «Vəsailuş-şiə» cild 3, səh 508, hədis 7

Hətta, qızıl ya gümüş qaşıqla da yemək haramdır.[1] Amma qızıl, gümüş və ya başqa bir şeydən düzəldiyi məlum olmayan qabdan yemək yeməyin eybi yoxdur.

## YEMƏKLƏ BAĞLI BƏZİ MÜSTƏHƏBB ƏMƏLLƏR

1. Yeməkdən qabaq və sonra əlləri yumaq müstəhəbdir. İmam Sadiq (ə) buyurur:

**اغسلو أيديكم قبل الطعام و بعده فإنه ينفى الفقر يزيد في العمر**

**«Yeməkdən əvvəl və yeməkdən sonra əllərinizi yuyun. Bu əməl yoxsuluğu aradan aparar və ömrü uzadar.»** [2]

2. Yeməyə başlayanda "bismillah", qurtardıqda isə "əlhəmdulillah" demək müstəhəbbdir. Allah Rəsulu (s) buyurur:

**إذا وضعت المائدة حفتها أربعة آلاف ملك فإذا قال العبد بسم الله قالت الملائكة بارك الله عليكم في طعامكم ثم يقولون للشيطان اخرج يا فاسق لا سلطان لك عليهم فإذا فرغوا فقالوا الحمد لله قالت الملائكة قوم أنعم الله عليهم فأدوا شكر ربهم و إذا لم يسموا قالت الملائكة للشيطان ادن يا فاسق فكل معهم فإذا رفعت المائدة**

---

1 Ayətullah Xorasani və Ayətullah Sistani , katiblik

2 «Vəsailuş-şiə»; adabul-maidə; bab 49; hədis 10

و لم يذكروا اسم الله عليها قالت الملائكة قوم أنعم الله عليهم فنسوا ربهم.

**Süfrə açıldıqda dörd min mələk həmin süfrəni əhatəyə alar. Əgər bəndə bismillah desə, mələklər (süfrə arxasında əyləşmiş insanlara) deyər: «Allah yeməklərinizi bərəkətli etsin.» Sonra isə şeytana deyərlər: «Çıx buradan ey fasiq! Bu şəxslərin üzərində sənin heç bir hökmranlığın yoxdur.» Əgər süfrədən qalxdıqda əlhəmdulillah desələr, mələklər bu cür deyər: «Allah onlara nemət verdi. Onlar da (əvəzində) Rəbblərinə şükr etdilər.» Amma (süfrə salındıqda) Allahın adını çəkməsələr, mələklər şeytana bu cür deyərlər: «Yaxın gəl ey fasiq! Sən də bunlarla birgə ye!» Süfrə qaldırıldıqda da Allahın adını çəkməsələr, mələklər deyərlər: «Allah onlara nemət verdi. Onlar isə Rəbblərini unutdular.»** [1]

Həmçinin Muhəmməd ibn Əli ibn Osman Kəracəki «Kənzul-Fəvaid» kitabında nəql edir:

ان أبا حنيفة اكل معه فلما رفع الصادق (ع) يده من اكله قال الحمد لله رب العلمين اللهم هذا منك و من رسولك (ص) فقال

[1] «Vəsailuş-şiə»; adabul-maidə; bab 57; hədis 1

أبو حنيفة يا أبا عبد الله أجعلت مع الله شريكا فقال له ويلك ان الله يقول في كتابه و (ما نقموا الا ان أغناهم الله و رسوله من فضله) و يقول في موضع آخر ( و لو أنهم رضوا ما آتيهم الله و رسوله و قالوا حسبنا الله سيؤتينا الله من فضله و رسوله) فقال أبو حنيفة و الله لكأني ما قرأتهما قط.

**Bir gün Əbu Hənifə[1] İmam Sadiqlə (ə) birlikdə yemək yeyirdi. İmam Sadiq (ə) yeməyi bitirdikdə buyurdu: «Bütün həmdlər aləmlərin Rəbbi olan Allaha məxsusdur. Ey Allahım bu (yemək) səndən və sənin Rəsulundandır (s).» Əbu Hənifə dedi: «Ey Əbu Əbdillah, sən Allaha şərik qoşursan?» İmam Sadiq (ə) buyurdu: «Vay olsun sənə! Allah Təala öz kitabında buyurur:** ***«(Münafiqlərin Peyğəmbərə və möminlərə qarşı) kin-küdurət bəsləmələrinin səbəbi yalnız Allahın və Peyğəmbərinin Öz nemətləri ilə onları varlandırmasıdır.»***[2] **Başqa bir yerdə isə belə buyurur:** ***«Kaş ki, onlar Allahın və Onun Elçisinin onlara verdiyinə razı qalıb deyəydilər: Allah bizə yetər. Allah da bizə Öz lütfündən verəcək, Onun Elçisi də.»***[3] **Əbu Hənifə**

[1] Hənəfi məzhəbinin banisi
[2] «Tövbə» 74
[3] «Tövbə» 59

**dedi: «And olsun Allaha! Sanki bu ayələri heç oxumamışam.»**[1]

3. Yemək əsnasında da əlhəmdulillah demək müstəhəbbdir. Zürarə[2] deyir:

أكلت مع أبي عبد الله (ع) طعاما فما أحصي كم مرة قال الحمد لله الذي جعلني أشتهيه

**«Bir gün Əbu Əbdillahla**[3] **(ə) bir yerdə yemək yeyirdim. Mən onun (yemək əsnasında) nə qədər "həmd olsun o Allaha ki, məni yeməyə iştahalı qərar verib" dediyini saya bilmədim.»**[4] Yəni İmam (ə) yemək əsnasında o cümləni çox təkrar edirmiş.

4. Sağ əllə yemək müstəhəbbdir. İmam Cəfər Sadiq (ə) buyurur:

لا تأكل باليسرى و أنت تستطيع

**« (Sağ əllə yeməyə ) imkanın olduğu halda sol əllə yemə.»**[5]

5. Üç və daha artıq barmaqla yemək və iki barmaqla yeməmək müstəhəbbdir. İmam Sadiq (ə) buyurur:

---

[1] «Vəsailuş-şiə» kitabından nəqlən; adabul-maidə; bab 56; hədis 9
[2] İmam Sadiqin (ə) ən yaxın səhabələrindən biri
[3] Əbu Əbdillah İmam Sadiqin (ə) kunyəsidir.
[4] «Cəvahirul-Kəlam»; c.36; səh. 453
[5] «Vəsailuş-şiə»; adabul-maidə; bab 10; hədis 3

كان رسول الله (ص) يأكل بثلاث أصابع...

**«Allahın Rəsulu (s) həmişə üç barmaqla yeyərdi…»**[1]

6. Müstəhəbbdir ki, qonaqlıqda yeməyə hamıdan əvvəl ev sahibi başlasın və yeməyi hamıdan axırda o bitirsin. İmam Cəfər Sadiq (ə) buyurur:

كان رسول الله (ص) إذا أكل مع القوم أول من يضع يده و آخر من يرفعها ليأكل القوم.

**«Allahın peyğəmbəri (s) insanlar (rahat və utanmadan) yemək yesinlər deyə onlarla bir süfrə arxasında oturarkən yeməyə hamıdan əvvəl başlayar və hamıdan sonra bitirərdi.»** [2]

7. Müstəhəbbdir ki, yeməyə başlamamışdan qabaq əvvəlcə süfrə sahibi əllərini yusun. Bu iş onun sağ tərəfində oturan adamdan başlayıb sol tərəfində oturan adama qədər davam etsin. Yeməkdən sonra isə müstəhəbbdir ki, qonaqlar ev sahibinin solunda oturan şəxsdən başlayıb sağ tərəfdə oturan şəxsə qədər tərtiblə əllərini yusunlar. Ən axırda isə ev sahibi əlini yusun.

İmam Baqir (ə) buyurur:

صاحب الرحل يتوضأ أول القوم و آخر القوم بعد الطعام.

---

[1] «Cəvahirul-Kəlam»; c.36; səh. 457
[2] «Cəvahirul-Kəlam»; c.36; səh. 454

**«Ev sahibi (yeməyə başlayanda) əllərini hamıdan əvvəl, yeməkdən sonra isə hamıdan axırda yuyar.»** [1]

Əllamə Kuleyni «Kafi» kitabında yazır:

«Digər bir hədisdə deyilir: Əllərini əvvəlcə ev sahibi yuyar, sonra onun sağ tərəfində oturan şəxsdən başlanılar. Süfrə qaldırıldıqdan sonra isə (əllərin yuyulmasına) ev sahibinin solunda oturan şəxsdən başlanılar. Əlini axırıncı yuyan şəxs isə ev sahibi olar. Çünki səbr edib camaatı gözləmək daha yaxşıdır.»[2]

8. Yeməyi duzla başlayıb və duzla bitirmək müstəhəbbdir. İslam Peyğəmbəri (s) buyurur:

**افتتح طعامك بالملح واختم به فان من افتتح طعامه بالملح وختم به عوفي من اثنين وسبعين نوعا من أنواع البلاء ، منه : الجنون والجذام والبرص**

**«Yeməyi duzla başla, duzla bitir! Kim yeməyini duzla başlasa və onunla bitirsə, yetmiş iki növ bəla ondan bağışlanar. Dəlilik, cüzam və bərəs həmin bəlalardandır.»**[3]

9. Meyvəni yeməmişdən qabaq yumaq müstəhəbbdir. İmam Sadiq (ə) buyurur:

---

[1] «Cəvahirul-Kəlam»; c.36; səh. 455

[2] «Vəsailuş-şiə» kitabından nəqlən; adabul-maidə; bab 50; h 3

[3] «Vəsailuş-şiə»; adabul-maidə; bab 95; h. 1

إن لكل ثمرة سما فإذا أتيتم بها فلمسوها الماء واغمسوها في الماء يعني اغسلوها

**«Hər bir meyvədə zəhər [1] var. Elə isə, sizə meyvə gətirildikdə onu suya çəkin və suda yuyun.»[2]**

10. Yemək yedikdən sonra arxası üstə uzanıb sağ ayağı sol ayağın üzərinə qoymaq müstəhəbbdir. İmam Rza (ə) buyurur:

إذا أكلت فاستلق على قفاك وضع رجلك اليمنى على اليسرى

**«Yedikdən sonra arxası üstə uzan və sağ ayağını sol ayağının üzərinə qoy.»[3]**

11. Yeməkdən əvvəl və sonra Məsumlardan (ə) nəql olunmuş dualar oxumaq müstəhəbbdir. Məsələn, yeməkdən sonra müstəhəbbdir ki, belə deyilsin:

الحمد لله الذي اطعمنا و سقانا و كفانا و أيدنا و آوانا و انعم علينا و أفضل الحمد لله الذي يطعم و لا يطعم. اللهم أكثرت و أطبت و باركت و اشبعت و أرويت الحمد لله الذي يطعم و لا يطعم.

[1] Zəhərdən məqsəd insan üçün zərərli olan mikroblar və s.-dir.
[2] «Vəsailuş-şiə»; ətimətul-mubahə; bab 80; h. 1
[3] «Vəsailuş-şiə»; adabul-maidə; bab 74; h. 1

**«Bütün həmdlər o Allaha məxsusdur ki, bizi yedirdi, içirdi, bizə (yalnız O) kifayət etdi, bizi qüvvətləndirdi, bizə sığınacaq və nemət verdi. Ən üstün həmdlər o Allaha məxsusdur ki, Özü yemədiyi halda (yeməyə ehtiyacı olmadığı halda bizi) yedirir. Ey Allahım! (süfrəmizi) bol et, (haramlardan) pakla, bərəkətləndir, (bizləri) doyur, susuzluğumuzu yatır. Həmd olsun Özü yemədiyi halda (yeməyə ehtiyacı olmadığı halda bizləri) yedirən Allaha. »**[1]

12. Əgər müsəlman bir şəxs başqa bir müsəlmanı süfrəyə dəvət edərsə, onun dəvətini qəbul etmək müstəhəbbdir. İmam Sadiq (ə) buyurur:

**ان من حق المسلم على المسلم ان يجيبه إذا دعاه**

**«Müsəlmanın müsəlmana olan haqqlarından biri də budur ki, (bir müsəlman) onu süfrəyə dəvət etdikdə, dəvətini qəbul etsin.»**[2]

13. Möminlərə yemək vermək, onları Allaha xatir doyurmaq müstəhəbdir və böyük savabı vardır. İmam Sadiq (ə) buyurur:

**من أطعم أخاه في الله كان له من الاجر مثل من أطعم فئاما من الناس**

---

[1] «Vəsailuş-şiə»; adabul-maidə; bab 59; h. 9

[2] «Vəsailuş-şiə»; adabul-maidə; bab 16; h. 1

**«Kim Allah yolunda mömin bir qardaşına təam versə, onun üçün yüz min insana təam verməyin savabı yazılar.»**[1]

Başqa bir hədisdə isə İmam (ə) belə buyurur:

من أطعم عشرة من المسلمين أوجب الله له الجنة

**«Kim on nəfər müsəlmana təam versə, Allah cənnəti ona vacib edər.»**[2]

Həmçinin süfrə arxasında yemək yeyərkən tikələri kiçik götürmək, süfrədə çox oturub vaxtı uzatmaq, yeməkdən sonra dişlərin arasında qalmış yemək qırıntılarını təmizləmək kimi əməllər də müstəhəbbdir.

## SU İÇƏRKƏN MÜSTƏHƏBB VƏ MƏKRUH OLAN ƏMƏLLƏR

Su nəinki dünya, hətta, axirət içkilərinin belə ağasıdır.[3] Onun dadı həyat dadıdır.[4] Su içərkən müstəhəbb olan əməllər barəsində bir çox hədislər nəql olunmuşdur. Onlardan bəzilərini siz əzizlərin nəzərinə çatdırırıq.

1. Gündüz vaxtı suyu ayaq üstə içmək müstəhəbbdir. İmam Sadiq (ə) buyurur:

[1] «Vəsailuş-şiə»; adabul-maidə; bab 43; h. 2
[2] «Vəsailuş-şiə»; adabul-maidə; bab 12; h. 4
[3] «Cəvahirul-Kəlam»; c.36; səh. 505
[4] «Vəsailuş-şiə»; əşribətul-mubahə; bab 1; h. 3,4,6

شرب الماء من قيام بالنهار يمرئ الطعام

**«Gündüz vaxtı ayaq üstə su içmək yeməyi (insan üçün) xeyirli edər.»**[1]

2. Suyu üç nəfəsə içmək müstəhəbbdir. İmam Sadiq (ə) buyurur:

ثلاثة أنفاس أفضل في الشرب من نفس واحد

**«Suyu üç nəfəsə içmək bir nəfəsə içməkdən daha fəzilətlidir.»**[2]

3. Hər dəfə su içdikdə İmam Hüseynin (ə) qatillərinə lənət oxumağın böyük savabı vardır. İmam Sadiq (ə) buyurur:

وما من عبد شرب الماء فذكر الحسين عليه السلام وأهل بيته ولعن قاتله إلا كتب الله عز وجل له مائة ألف حسنة وحط عنه مائة ألف سيئة ، ورفع له مائة ألف درجة ، وكأنما أعتق مائة ألف نسمة ، وحشرة الله يوم القيامة ثلج الفؤاد

**«Su içən zaman Hüseyni (ə) və onun Əhli-beytini xatırlayan və qatillərinə lənət oxuyan elə bir bəndə yoxdur ki, Allah-təala onun üçün yüz min savab yazmasın və onun yüz min günahını silməsin. (Allah-təala həmin şəxsin məqamını) yüz min dərəcə**

---

[1] «Vəsailuş-şiə»; əşribətul-mubahə; bab 7; h. 2

[2] «Vəsailuş-şiə»; əşribətul-mubahə; bab 9; h. 2

**yüksəldər. Sanki o, yüz min nəfəri (qulu) azad etmişdir. Allah qiyamət günündə onu qəlbi sevincli halda məhşərə gətirər.»**[1]

Bunlardan əlavə su içmədən öncə «bismillah», içdikdən sonra isə «əlhəmdulillah» demək, su içməyə meyli olduqda su içmək və suyu sovuraraq içmək də müstəhəbbdir.

Çox su içmək, yağlı xörəkdən sonra və gecə ayaq üstə su içmək, sol əllə su içmək, qabın sınıq yerindən və həmçinin qulpu olan yerindən su içmək Məsumlardan (ə) nəql olunmuş hədislərdə məzəmmət olunmuşdur. [2]

## YEMƏKLƏ BAĞLI BƏZİ MƏKRUH ƏMƏLLƏR

1. Çox yemək məkruhdur. Yaradılmışların ən xeyirlisi və peyğəmbərlərin sonuncusu olan Həzrət Muhəmməd (s) buyurur:

**المؤمن يأكل في معاء واحد ، والمنافق يأكل في سبعة أمعا**

**«Mömin bir qarına yeyər, münafiq [3] isə yeddi qarına.»**[4]

Başqa bir hədisdə İmam Sadiq (ə) belə buyurur:

---

1 «Vəsailuş-şiə»; əşribətul-mubahə; bab 27; h. 1
2 «Vəsailuş-şiə»; əşribətul-mubahə;
3 Münafiq-üzdə islamı qəbul edib, batində onu inkar edən.
4 «Cəvahirul-Kəlam»; c.36; səh. 462

كثرة الأكل مكروه

**«Çox yemək məkruhdur.»**[1]

2. Tox qarına yemək məkruhdur. İmam Sadiq (ə) buyurur:

الأكل على الشبع يورث البرص

**«Tox qarına yemək bərəs xəstəliyinə səbəb olar.»**[2]

3. Yeriyə-yeriyə yemək yemək məkruhdur. İmam Sadiq (ə) buyurur:

لا تأكل وأنت تمشي إلا أن تضطر إلى ذلك

**«Məcburiyyət qarşısında qaldığın hal istisna olmaqla, yeməyi yeriyərək yemə.»**[3]

4. Sol əllə yemək məkruhdur. İmam Sadiq (ə) buyurur:

لا يأكل بشماله ولا يشرب بشماله

**«İnsan sol əllə yeməməli və sol əllə içməməlidir.»** [4]

5. Yeməyi qaynar halda yemək məkruhdur. İmam Sadiq (ə) buyurur:

الطعام الحار غير ذي بركة

**«Qaynar yemək bərəkətsiz olar.»**[5]

---

[1] «Cəvahirul-Kəlam»; c.36; səh. 462
[2] «Cəvahirul-Kəlam»; c.36; səh. 465
[3] «Cəvahirul-Kəlam»; c.36; səh. 469
[4] «Cəvahirul-Kəlam»; c.36; səh. 465
[5] «Vəsailuş-şiə»; adabul-maidə; bab 91; h. 1

6. Yeyib-içdiyini üfürmək məkruhdur. Nəql olunur ki, Peyğəmbər (s) insanları bu əməldən çəkindirərdi.[1]

Bunlardan əlavə çörəyi bıçaqla kəsmək, onu yemək qabının altına qoymaq, yemək yeyərkən yemək halında olan başqa birisinin üzünə baxmaq, sümüyə yapışmış əti heç nə qalmayacağı şəkildə təmizləmək, süfrəyə çörək qoyulduqdan sonra başqa bir şeyi gözləmək, meyvənin qabığını soymaq, onu axıra qədər yemədən atmaq kimi əməllər də məkruhdur.

[1] «Vəsailuş-şiə»; adabul-maidə; bab 92; h. 1

# II BÖLMƏ
# HEYVAN KƏSİMİ

## TƏZKİYƏ

Atıcı qanı olan hər hansı bir heyvan əgər şəriətdə müəyyən edilmiş qaydalara əsasən öldürülməsə, nəcis (murdar) və haram, sayılır. Lakin şəri qaydalara əsasən öldürülsə (bəziləri istisna olmaqla) [1] pak sayılır. Şəri qaydalara əsasən öldürülən heyvan təzkiyə edilmiş (pak) heyvan adlanır. Ətinin halal olması isə heyvanın növünə bağlıdır. Yəni əgər əti halal olan heyvan növündəndirsə halal, əti haram olan heyvan növündəndirsə təzkiyə edilməsinə (pak olmasına) baxmayaraq haramdır.

## TƏZKİYƏ EDİLMƏSİ MÜMKÜN VƏ QEYRİ-MÜMKÜN OLAN HEYVANLAR

1. Əti halal olan hər bir heyvanı təzkiyə etmək mümkündür. Yəni onlar şəri qaydalara əsasən kəsilsə, pak sayılırlar.

2. Nəcisi-eyn [2] olan heyvanları təzkiyə etmək mümkün deyil. Məsələn, it və donuz. Əgər donuzu və ya iti şəri

[1] Məsələn donuz və it
[2] Yəni öldürülməmişdən qabaq belə nəcis (murdar) sayılan heyvanlar

qaydalara əsasən (üzü qibləyə, bismillahla) kəssələr belə, onun əti nəcisdir.

3. İnsanın yaxınlıq etdiyi əti halal heyvanın əti və südü, həmçinin  törəmələrinin əti və südü haramdır. Bu cür heyvanı şəri qaydada kəssələr, ətinin haram olmasına baxmayaraq cəsədi pak sayılar.

4. Cəllal (insan nəcisi yeməyə adət etmiş) heyvan şəri qaydada kəsildikdə əti və dərisi pak, onları yemək isə haramdır. Lakin kəsilməmişdən qabaq şəriətdə müəyyən edilmiş qaydalara uyğun istibra edilsə, ətini yemək halal olar.

5. Sümüyü donuz südü içməklə bərkimiş çəpiş və onun törəmələri şəri qaydalara əsasən kəsilsələr belə, halal sayılmazlar. Lakin əti və dərisi pakdır. Vacib-ehtiyata əsasən donuz südü içməklə sümüyü bərkimiş quzu da eyni hökmdədir.

6. Əgər çəpiş və ya quzu az miqdarda donuzdan süd içərsə, əti haram olar. Onun əti şəri qaydada kəsilməklə halal sayılmaz. Amma bədəni pak olar. Əgər kəsilməmişdən qabaq istibra edilsə, əti halal olar.[1]

---

[1] 3,4,5 və 6-cı bənddəki məsələlərin mənbəsi:Ayətullah Sistani «Minhacus-salihin» c.3 məs.868

7. Əti halal olub, lakin atıcı qanı olmayan heyvanlar (məsələn, balıq və çəyirtkə) təzkiyə olunmağa qabildirlər.[1]

8. Əti haram olub, atıcı qanı olmayan heyvanlar (məsələn, kərtənkələ), ümumiyyətlə, təzkiyə mövzusuna daxil deyillər. Çünki onlar istər diri olsunlar, istərsə də ölü pakdırlar.[2]

9. Şeyx Muhəmməd Nəcəfinin (r.ə.) «Cəvahirul-kəlam» kitabında qeyd etdiyinə əsasən, məşhur nəzər budur ki, yer altında yaşayan siçan və siçovul kimi atıcı qana malik kiçik heyvanlar şəri qaydada kəsilsələr və ya ovlansalar belə, təzkiyə olunmuş sayılmazlar.[3] Yəni nəcis olarlar. Bu barədə mərcəi-təqlid müctəhidlərin nəzərləri isə aşağıdakılardır:

*Ayətullah Xoyi*: Şəri qaydada kəsilsələr və ya ovlansalar pakdırlar.[4]

*Ayətullah Xorasani:* Faydalı dərisi olmasa, şəri qaydada kəsilsə və ya ovlansa belə, nəcisdir. Dərisinin faydalı olduğu təqdirdə isə pak olması mübahisəlidir.[5]

*Ayətullah Sistani:* Nəcisdir.[6]

---

[1] Balıq və çəyirtkənin təzkiyəsindən məqsəd ətlərinin halal olmasıdır. Çünki onlar öz-özünə də ölsələr nəcis deyillər.
[2] Pak olmağı onun halal olması demək deyil.
[3] «Cəvahirul-kəlam»; c.36; səh. 199
[4] «Tovzihul-məsail»; Xoyi məsələ 2598
[5] «Tovzihul-məsail»; məsələ 2653
[6] «Tovzihul-məsail»; məsələ 2598

*Ayətullah Təbrizi:* Şəri qaydada kəsilsə və ya ovlansa ( bu şərtlə ki, ov iti ilə ovlanmasın) pakdır.[1]

10. Kitabın birinci bölməsində məlum oldu ki, bütün yırtıcı heyvan və quşların əti haramdır (şəri qaydada kəsilmiş olsalar belə). Bu barədə fəqihlər arasında heç bir fikir ayrılığı yoxdur. Bəs, görəsən, yırtıcı heyvanlar və quşlar şəri qaydada kəsilməklə pak hesab olunurlarmı?

Muhəmməd Cavad Muğniyyənin (r.ə.) «Fiqhul-İmam Cəfəris-Sadiq» kitabında qeyd etdiyinə əsasən məşhur nəzər budur ki, şir, pələng, canavar, tülkü, pişik, şahin, qartal və s. yırtıcı heyvan və quşlar şəri qaydalara əsasən kəsilməklə və ya şəri qaydalar əsasında ovlanmaqla əti və dəriləri pak olur. [2] Lakin əksər fəqihlər yırtıcı heyvanın ov iti ilə ovlandığı təqdirdə ət və dərisinin pak olmasını işkallı (mübahisəli) bilirlər. Hətta *Ayətullah Təbrizi* ehtiyat-vacibə əsasən, pak olmadığını buyurur.[3]

11. Hədislərdə məsx olunduqları qeyd olunan heyvanlar (məsələn, fil və meymun) əksər fəqihlərin nəzərinə görə, təzkiyə edilməyə qabildirlər. [4] Yəni onlar şəri qaydalara əsasən kəsilsələr, ətlərinin haram olmasına baxmayaraq ət və dəriləri pak hesab olunur.

---

[1] «Tovzihul-məsail»; məsələ 2598
[2] «Fiqhul-İmam Cəfəris-Sadiq» 4-cü cild; səh 342
[3] «Tovzihul-məsail»; məsələ 2597
[4] «Fiqhul-İmam Cəfəris-Sadiq» 4-cü cild; səh 343

Qeyd: Əziz oxucular pak və halal anlayışlarını qarışdırmasınlar. Hər pak heyvanın əti halal deyildir. Məsələn, canavar yırtıcı olduğuna görə halal deyildir. Onun yeyilməsi haramdır. Şəri qaydada üzü qibləyə kəsilərsə, əti və dərisi sadəcə pak sayılır. Yəni onun dərisindən, məsələn, ayaqqabı hazırlansa, ayaqqabı pak sayılacaq və nəcis hökmünə daxil olmayacaq. Amma bununla belə onun əti yenə də haramdır.

## HEYVAN KƏSƏN ŞƏXS

Heyvanın başını kəsən insan istər kişi olsun, istərsə qadın, gərək müsəlman olsun. İmam Cəfər Sadiqdən (ə), qadının kəsdiyi heyvandan yemək olarmı-deyə soruşdular. İmam (ə) buyurdu:

**إذا كانت مسلمة فذكرت اسم الله عليها**

**«Əgər o qadın müsəlmandırsa və heyvanın başı üzərində Allahın adını zikr edərsə (yemək olar).»**[1]

Müsəlman uşağı əgər müməyyiz (yaxşı və pisi ayıra bilən) olsa, heyvanın başını kəsə bilər. İmam Cəfər Sadiqdən (ə) bir oğlan uşağının kəsdiyi heyvan haqqında soruşdular. İmam (ə) buyurdu:

---

[1] «Vəsailuş-şiə»; əz-zəbaih; bab 24; hədis 6

**إذا قوى على الذبح وكان يحسن ان يذبح وذكر اسم الله عليها فكل**

**«Əgər onun kəsməyə qüvvəsi olsa və Allahın adını zikr edərək düzgün kəsərsə (onun kəsdiyindən) yeyə bilərsən.»**[1]

Heyvan kəsənin şiə və ya sünni, mömin və ya fasiq (aşkarda günah edən) bir şəxs olmasının heç bir fərqi yoxdur. Əgər heyvanın başını vələdüz-zina (zinadan doğulmuş) bir şəxs kəsərsə yenə də heyvanın halallığına zərər gəlməz. İmam Sadiqdən (ə) vələdüz-zinanın kəsdiyi heyvanın hökmünü soruşdular. İmam (ə) belə cavab verdi:

**لا بأس به...**

**«Onun (yeyilməsinin) eybi yoxdur (yəni halaldır)...»**[2]

Boynunda cənabət və ya heyz (aybaşı) qüslü olan şəxs heyvanın başını şəri qaydalara əsasən kəsərsə, heyvanın əti halal olar. İmam Sadiq (ə) buyurur:

**لا بأس بأن يذبح الرجل وهو جنب**

**«Cənabət halında olan bir şəxsin heyvanı kəsməsinin heç bir eybi yoxdur»**[3]**.**

---

[1] «Vəsailuş-şiə»; əz-zəbaih; bab 22; hədis 2
[2] «Fiqhul-İmam Cəfəris-Sadiq» c.4, səh.346
[3] «Vəsailuş-şiə»; əz-zəbaih; bab 17; hədis 1

Sünnət olunmamış şəxsin şəri qaydalara əsasən kəsdiyi heyvanın əti halaldır.  İmam Sadiq (ə) buyurur:

كان علي عليه السلام لا يرى به بأسا

**«Əmirəl-möminin Əli (ə) bunda (sünnətsiz şəxsin kəsdiyini yeməkdə) heç bir eyb görməzdi.»**[1]

Öz hərəkətini anlamayan (məsələn, dəli, yuxulu və ya sərxoş) şəxsin  kəsdiyi heyvan halal olmaz. Lakin zahir nəzər [2] budur ki, əgər öz əməlinə müməyyiz olsa, yəni özünü idarə edə bilsə və öz hərəkətindən xəbəri olsa, üzü qibləyə bismillahla kəsdiyi heyvan halal olar.

Əgər müsəlman olan bir şəxsi heyvanı kəsməyə məcbur etsələr o da heyvanı lazımi şərtlər daxilində kəsərsə, bu əməli məcburiyyət üzündən yerinə yetirməsinə baxmayaraq kəsdiyi heyvan halal sayılır.[3]

Əgər kafir və kafir hökmündə olan nasibi, xəvaric və ya ğulat əhlindən olan bir şəxs heyvanı üzü qibləyə tutub Allahın adını zikr edərək kəssə  belə, onun əti haramdır. Şəhid Sani (r.ə.) «Məsalikul-əfham» kitabında yazır: «Bütün şiə alimləri, hətta, bütün müsəlman (istər sünni, istər şiə)

---

[1] «Vəsailuş-şiə»; əz-zəbaih; bab 17; hədis 3

[2] «Minhacus-salihin» Xoyi,Təbrizi c.2, məs. 1636; Xorasani c.3 məs. 1636

[3] Həmin mənbə

alimləri əhli-kitab (yəhudi və xristian) olmayan kafirin kəsdiyi heyvanın haram olmasında yekdil rəydədirlər.» [1]

## ƏHLİ-KİTABDAN OLAN KAFİRİN KƏSDİYİ HEYVAN

Xristian və ya yəhudi olan bir şəxs heyvanı üzü qibləyə bismillahla kəssə, onun əti halal olarmı? Bu barədə alimlərin nəzərlərini üç hissəyə bölmək olar:

1. Şiə məzhəbinin böyük alimləri (onlardan Şeyx Tusi, Seyyid Mürtəza, Mühəqqiq Hilli və b.) və həmçinin, məzhəbin əksər alimlərinin nəzərinə görə, əhli-kitabın kəsdiyi heyvan haramdır.

2. İbn Əbi Əqil [2] (r.ə.) və Əbu Əli ibn Cüneyd [3] (r.ə.) kimi qədim alimlər əhli-kitabın kəsdiyi heyvanın halal olduğuna qail olmuşlar. Əlbəttə, bu şərtlə ki, heyvanın halal olması üçün digər şəri şərtlər (qiblə, bismillah və b.) yerinə yetirilmiş olsun.

3. Sonuncu nəzər Şeyx Səduqa (r.ə.) aiddir. Belə ki, o, əhli-kitabdan olan kafirin kəsdiyi heyvanı halal bilmişdir. Lakin bu şərtlə ki, insan gərək onun bismillah dediyini eşitmiş olsun.

---

[1] «Məsalikul-əfham» cild 11; səh.451

[2] Hicri tarixi ilə 4-cü əsrdə yaşamış alimlərdən olmuşdur. Digər adı Həsən ibn Əli Ümmanidir.

[3] Hicri tarixi ilə 381-ci ildə vəfat etmişdir. Şiə məzhəbinin böyük alimlərindən olmuşdur. Digər adı Muhəmməd ibn Əhməd İskafidir.

Şəhid Saninin (r.ə.) dili ilə desək: «Bu ixtilafların mənşəyi Məsumlardan (ə) nəql olunmuş hədislərin müxtəlif olmasındadır... Amma hər bir halda (hədislərin müxtəlif olmasına baxmayaraq) böyük alimlərin nəzərindən (birinci nəzərdən) kənara çıxılmamalıdır. Hətta demək olar ki, bu məsələ (əhli-kitabın kəsdiyi heyvanın haram olması məsələsi) şiə məzhəbinin zəruri hökümlərindən hesab olunur. Üstəlik bu hökm ehtiyata da uyğundur.»[1]

Müasir mərcəi-təqlid müctehidlər də əhli-kitabın kəsdiyi heyvanların haram olduğunu buyururlar.

Qeyd: Bu nəzərlərin hər birinin dəlillərini öyrənmək istəyənlər Şeyx Nəcəfinin (r.ə.) «Cəvahirul-kəlam», Şəhid Saninin (r.ə.) «Məsalikul-əfham» həmçinin Ayətullah Seyyid Sadiq Ruhaninin «Fiqhus-Sadiq» kitablarına müraciət edə bilərlər.[2]

## KƏSİCİ ALƏT

İxtiyari halda yəni heç bir zərurət olmadıqda heyvanın başı dəmirdən olan kəsici alətlə (məsələn, bıçaqla) kəsilməlidir. Əgər dəmir bıçaq tapmağa imkan olduğu təqdirdə heyvanın başını, məsələn, gümüş, qızıl, mis və ya qurğuşundan olan bir metalla və yaxud başqa bir kəsici

[1] «Məsalikul-əfham» cild 11; səh.452 və 465
[2] «Cəvahirul-Kəlam» c.36 «Məsalikul-əfham» c.11 «Fiqhus-Sadiq» c.24

alətlə kəsərlərsə, onun əti halal olmaz. Şeyx Nəcəfi (r.ə.) bu məsələdə heç bir ixtilafın olmadığını yazır.[1] Alimlər bu məsələyə Məsumlardan (ə) nəql olunmuş çoxsaylı hədisləri dəlil gətirirlər. Onlardan bəziləri aşağıdakılardır:

Muhəmməd ibn Muslim deyir:

**سألت أبا جعفر عليه السلام عن الذبيحة بالليطة وبالمروة ، فقال : لا ذكاة إلا بحديدة**

**«İmam Baqirdən (ə) heyvanı qamış və çaxmaq daşı ilə kəsmək barəsində soruşdum. Buyurdu: Dəmirdən qeyrisi ilə halal olmaz.»**[2]

Başqa bir hədisdə Hələbi deyir:

**سألته عن ذبيحة العود والحجر والقصبة ، فقال : قال علي: لا يصلح إلا بحديدة**

**«İmam Sadiqdən (ə) heyvanı ağac (taxta), daş və qamışla kəsmək barəsində soruşdum. Buyurdu: Əmirəl-möminin Əli (ə) buyurmuşdur: Dəmirdən qeyrisi ilə olmaz.»**[3]

Digər bir hədisdə isə İmam Cəfər Sadiq (ə) buyurur:

**لا يؤكل ما لم يذبح بحديدة**

---

[1] «Cəvahirul-kəlam»; c.36; səh. 100

[2] «Vəsailuş-şiə»; əz-zəbaih; bab 1; hədis 1

[3] «Vəsailuş-şiə»; əz-zəbaih; bab 1; hədis 2

**«Dəmirlə kəsilməyən (heyvan) yeyilməz.»**

Lakin qeyd etmək lazımdır ki, fəqihlərdən bəziləri bu fikirdədirlər ki, ixtiyari halda heyvanın başını bir tək dəmir yox, həmçinin, dəmirdən başqa ona oxşar metallarla da (mis və gümüş kimi) kəsmək olar. Məsələn «Fiqhul-İmam Cəfəris-Sadiq» kitabının müəllifi Muhəmməd Cavad Muğniyyə (r.ə.)[1] bu fikirdə olan fəqihlərdəndir. Bu alimlərin nəzərinə görə hədislərdə qeyd olunan dəmir sözü həm dəmir, həm də dəmirə oxşar olan digər metalları bildirmək üçün işlədilmişdir.

Lakin dəmir alət tapılmadıqda və heyvanın öləcəyindən qorxulsa və yaxud başqa bir zəruri hal onun təcili kəsilməsini tələb etsə, dəmirdən başqa digər kəsici əşyalarla (məsələn, şüşə, daş, qamış və s. ilə) heyvanı kəsmək olar.

Peyğəmbərdən (ə) soruşdular ki, bəzən səhrada olarkən heyvanı kəsmək üçün yanımızda bıçaq olmur. Bu halda nə etməliyik? Peyğəmbərlər ağası (s) buyurdu:

**أهرق الدم بما شئت واذكر اسم الله**

**«Allahın adını zikr edərək onu istədiyin əşya ilə kəs.»**[2]

Abdullah ibn Sinan İmam Sadiqin (ə) belə buyurduğunu nəql edir:

---

[1] «Fiqhul-İmam Cəfəris-Sadiq» c.4, səh.349-350
[2] «Vəsailuş-şiə»; əz-zəbaih; bab 1; hədis 3

لا بأس أن تأكل ما ذبح بحجر إذا لم تجد حديدة

**«Dəmir alət tapa bilmədiyin təqdirdə daşla kəsilmiş heyvanı yeməyində heç bir eyb yoxdur.»**[1]

İmam Sadiqdən (ə) üstündə dəmir bıçaq olmayan bir kişi heyvanı dəmirdən qeyri bir şey ilə kəsə bilərmi?-deyə soruşdular. İmam (ə) cavabında buyurdu:

اذبح بالحجر وبالعظم وبالقصبة وبالعود إذا لم تصب الحديدة ، إذا قطع الحلقوم وخرج الدم فلا بأس به

**«Dəmir alət əldə edə bilməsən, heyvanı daş, sümük, qamış və ya ağacla kəs. Hulqumu kəsilib, qanı xaric olarsa, yeyilməsində bir eyb yoxdur.»** [2]

Muhəmməd ibn Muslim bir gün İmam Baqirdən (ə) soruşdu ki, əgər heyvanı kəsməyə məcbur olsaq, amma dəmir bıçaq tapa bilməsək, nə etməliyik? İmam (ə) buyurdu:

إذا اضطررت إليها فإن لم تجد حديدة فاذبحها بحجر

**«Əgər heyvanı kəsməyə məcbursansa və dəmir tapa bilmirsənsə, o zaman onu daşla kəs.»**[3]

Bu məzmunda olan hədislər çoxdur. Biz qeyd etdiklərimizlə kifayətlənirik.

---

[1] «Cəvahirul-kəlam»; c.36; səh. 101
[2] «Cəvahirul-kəlam»; c.36; səh. 101
[3] «Cəvahirul-kəlam»; c.36; səh. 101

Hədislərə diqqət yetirsək, görərik ki, təkcə sonuncu - Muhəmməd ibn Muslimin nəql etdiyi hədis məcburiyyət halına dəlalət edir. Digər hədislərin isə zahirindən çıxan məna budur ki, heyvanı kəsməyə heç bir zərurət olmasa belə, (məsələn, heyvanın öləcəyindən qorxulmasa belə) dəmir bıçaq tapmadıqda onu dəmirdən qeyri alətlə kəsmək olar. İbn Muslimin hədisi isə bunun yalnız məcburiyyət qarşısında icazəli olduğuna dəlalət edir. Məhz bu səbəbdən də müctehidlərin bu məsələyə dair verdikləri fətvalar bir qədər müxtəlifdir:

*Ayətullah Seyyid Sistani*: Heyvanın başını kəsməyə heç bir zərurət olmasa belə, dəmir alət tapılmadığı halda, onun başını dəmirdən qeyri kəsici alətlərlə kəsmək olar.[1]

*Digər müctehidlər*: Şəxs dəmir alət tapmadığı təqdirdə yalnız heyvanı kəsməyə  məcbur olduğu zaman heyvanın başını dəmirdən qeyri alətlə kəsə bilər (məsələn, heyvanı kəsməsə, heyvan özü öləcəksə).[2] *Ayətullah Vəhid Xorasani* bu məsələdə vacib-ehtiyata əsasən, hökm verir.[3]

Xromla qarışıq dəmirdən düzəldilmiş bıçaqla heyvanın başını kəsmək olar. Lakin *Ayətullah Sistani* bunun mübahisəli olduğunu yazır.[4] Oraq və dəryaz kimi alətlərlə

---

[1] «Tovzihul-məsail», məs. 2603
[2] «Tovzihul-məsail»; Xoyi məs. 2603; Təbrizi məs.2603;
[3] «Tovzihul-məsail», məs.2657
[4] «Minhacus-salihin» Sistani c.3, məs.840

baş kəsməyin caiz olması isə uzaq görüş deyildir. Amma ehtiyat budur ki, zərurət olmadığı təqdirdə bu əməl tərk olunsun.[1]

Məcburi halda olsa belə, heyvanın başını diş və ya dırnaqla kəsmək işkallıdır (mübahisəlidir).[2]

Bu bəhsin sonunda bir məsələni qeyd etmək yerinə düşərdi. Fəqihlər buyururlar: Heyvanı kəsmək üçün dəmir alət tapa bilməyən şəxsin yanında, məsələn, biri gümüşdən digəri isə şüşədən olan iki kəsici alət varsa, bu halda metal alətdən istifadə etməlidir. Ümumiyyətlə, zərurət halında yalnız metal bir alət tapılmadıqda heyvanı daş, qamış, şüşə və bu kimi alətlərlə kəsmək olar. Başqa sözlə, heyvanı kəsmək üçün dəmir varsa, dəmirdən, dəmir yoxdursa, dəmirə oxşar metaldan olan hər hansı bir alətdən, o da yoxdursa, daş, qamış, şüşə və bu kimi qeyri-metal alətlərdən istifadə olunmalıdır.[3]

## HEYVAN KƏSMƏYİN QAYDALARI

Heyvanın halal olması üçün o müqəddəs şəriətimizdə əmr olunmuş qaydalara əsasən kəsilməlidir. Əgər bu

---

[1] «Minhacus-salihin» Xoyi, Təbrizi c.2, məs. 1639; Xorasani c.3 məs. 1639; Sistani c.3 məs.839

[2] Həmin mənbə

[3] «Fiqhul-İmam Cəfəris-Sadiq» c.4, səh.350

qaydalardan birinə əməl olunmazsa, həmin heyvan haram və nəcis olar. Bu qaydalar aşağıdakılardır:

1. İmkan olduğu təqdirdə heyvan gərək üzü qibləyə kəsilsin. Buna aid nəss (hədis) və icma (alimlərin ittifaqı) mövcuddur.[1] Heyvanı ayaq üstə və ya oturaq halda kəsmək olar. Bu iki vəziyyətdə heyvanın üzü qibləyə olması insanın namaz vaxtında (həm ayaq üstə, həm də oturduğu halda) üzü qibləyə olduğu hal kimidir. Amma heyvanı uzandığı halda kəsmək istəsələr gərək onu sağ və ya sol tərəfi üzərində elə uzatsınlar ki, qarını və kəsiləcək yeri qibləyə tərəf olsun. Lakin onun başının və ayaqlarının qibləyə tərəf olması lazım deyil.[2]

İmam Baqir (ə) buyurur:

**إذا أردت أن تذبح ذبيحتك فاستقبل بها القبلة**

**«Heyvanı kəsmək istədikdə, onu üzü qibləyə qoy.»** [3]

Əgər bir şəxs məsələni bildiyi halda heyvanı qəsdən qiblədən başqa səmtə doğru kəsərsə onun əti haram olar. Lakin onu qibləyə tərəf kəsmək yadından çıxarsa, bu haramlığa səbəb olmaz. İmam Sadiqdən (ə) qiblədən qeyri

---

[1] «Fiqhul-İmam Cəfəris-Sadiq» c.4, səh.351
[2] Sistani «Tovzihul-məsail» məsələ 2603
[3] «Vəsailuş-şiə»; əz-zəbaih; bab 14; hədis 2

səmtə doğru kəsilmiş heyvan haqqında soruşdular. İmam (ə) buyurdu:

**فلا بأس إذا لم يتعمد**

**« Bilərəkdən etməyibsə, (yeyilməsinin) heç bir eybi yoxdur.»**[1]

Əgər bir kəs hökmə cahil olsa, yəni heyvanı kəsərkən üzü qibləyə tutulmasının vacib olduğunu bilməsə və heyvanı qiblədən qeyri səmtə doğru kəsərsə, onun əti haram olmaz. Muhəmməd ibn Muslim İmam Baqirdən (ə) bu cür şəxs haqqında soruşduqda İmam (ə) belə cavab vermişdir:

**كل منها**

**«Onun kəsdiyindən yeyə bilərsən.»** [2]

Qeyd edək ki, cahil iki qismdir: Hökmə cahil və mövzuya cahil. Hökmə cahil budur ki, məsələn, qiblənin səmtini bilir, lakin heyvanı üzü qibləyə tərəf kəsməyin vacib olmasından xəbərsizdir. Mövzuya cahil budur ki, hökmdən xəbəri var. Məsələn bilir ki, heyvanı üzü qibləyə kəsmək vacibdir. Lakin qiblənin hansı səmtdə olduğunu bilmir.

Heyvanın üzü qibləyə kəsilməsi məsələsində hər iki cahil üzürlüdür. Fəqihlər buyurur: Mövzuya cahil

---

[1] «Vəsailuş-şiə»; əz-zəbaih; bab 14; hədis 3
[2] «Vəsailuş-şiə»; əz-zəbaih; bab 14; hədis 2

olmaq bütün məsələlərdə şəri üzr sayılır. Amma hökmə cahil olmaq ümumi mənada üzr sayılmır. Sadəcə olaraq bəzi hallar istisnadır (heyvanı qibləyə kəsmək məsələsi kimi). Çünki bu barədə dəlil (yuxarıda qeyd etdiyimiz hədis) vardır. [1]

Fərz edək ki, müsəlman olan bir şəxs qiblənin səmtini bilir. Amma əqidəsi budur ki, heyvanı üzü qibləyə kəsmək vacib deyil. Şəhid Sani (r.ə.) və Şeyx Nəcəfi (r.ə.) buyurur ki, belə bir şəxs heyvanı qiblədən qeyri səmtə, amma bismillahla kəsərsə, o heyvanın əti halal olar. Çünki həmin şəxs hökmə cahil olan şəxs kimidir.[2]

Əgər bir kəs qibləni təyin etməkdə xətaya yol verib heyvanı həmin istiqamətdə kəsərsə, sonradan səhv etdiyi məlum olsa belə, kəsdiyi heyvan halaldır. Əgər qibləni təyin etməyə imkanı olmazsa və yaxud heyvanı qibləyə tərəf çevirməyə qüdrəti çatmazsa və onu kəsməyə məcbur olarsa, qiblədən qeyri səmtə kəsə bilər.

Heyvanın başını kəsən şəxsin üzü qibləyə olması müstəhəbbdir.[3]

2. Gərək heyvanın başı üzərində Allahın adı zikr olunsun. Allah Təbarəkə və Təala buyurur:

---

[1] «Fiqhul-İmam Cəfəris-Sadiq» c.4, səh.351-də 5ci qeyd
[2] «Məsalikul-əfham» c.11 səh. 476; «Cəvahirul-kəlam» c.36 səh. 111
[3] «Fiqhul-İmam Cəfəris-Sadiq» c.4, səh.351

وَلَا تَأْكُلُوا مِمَّا لَمْ يُذْكَرِ اسْمُ اللَّهِ عَلَيْهِ وَإِنَّهُ لَفِسْقٌ

***«(Kəsilərkən başı) üzərində Allahın adı çəkilməmiş (və murdar olmuş) şeydən yeməyin ki, onu yemək, əlbəttə, (Allaha qarşı) itaətsizlikdir.»***[1]

Deməli, heyvanı kəsərkən başı üzərində Allahın adını çəkmək vacibdir. Bıçağı heyvanın boğazına qoyan zaman ya “bismillah”, ya “Allahu əkbər”, ya “əlhəmdulillah”, ya “subhanəllah” və yaxud da “la ilahə iləllah” demək kifayətdir. İmam Cəfər Sadiqdən (ə) heyvanın başı üzərində bu sözləri zikr etmək haqqında soruşdular. İmam (ə) buyurdu:

هذا كله من أسماء الله لا بأس به

**«Bunların hamısı Allahın adlarındandır. (Heyvanın başı üzərində bu sözlərin deyilməsində) heç bir eyb yoxdur.»** [2]

Amma yalnız bir tək “Allah” sözünü demək işkallıdır (mübahisəlidir).[3] Lakin *Ayətullah Vəhid Xorasani* bir tək “Allah” ləfzinin də kifayət etdiyini buyurur.[4] Həmçinin heyvanı kəsərkən Allahın adını başqa dillərdə də demək işkallıdır.[5]

---

[1] «Ənam» ayə 121
[2] «Vəsailuş-şiə»; əz-zəbaih; bab 16; hədis 1
[3] «Minhacus-salihin» Xoyi c.2, məs. 1656
[4] «Minhacus-salihin» c.3, məs. 1656
[5] Sistani «Minhacus-salihin» c.3 məs.846

Əgər bir şəxs qəsdən Allahın adını zikr etməsə, o heyvanın ətindən yemək haramdır. Amma bunu unutsa, heyvanın əti haram olmaz. Muhəmməd ibn Muslim İmam Baqirdən (ə) “bismillah”sız kəsilmiş heyvan haqqında soruşdu. İmam (ə) buyurdu:

إن كان ناسيا فلا بأس

**«Unutduğu halda heç bir eybi yoxdur.»**[1]

“Bismillah” deməyi unutmuş şəxs, demədiyini xatırlayarsa, ehtiyat-müstəhəbbdir ki, bu cür desin:

بسم الله على أوله وعلى آخره

**«Bismillah əla əvvəlihi və əla axirihi.»**[2]

Heyvanın başını kəsərkən gərək “bismillahı” onu kəsmək niyyəti ilə desin. Əgər başqa məqsədlər üçün Allahın adını çəkərsə, heyvanın əti halal olmaz.

Allahın adını çəkməyin vacib olduğunu bilməyən bir şəxs, əgər heyvanı “bismillah”sız kəsərsə, zahir nəzər budur ki, onun əti haram olar.[3] Bu məsələdə belə bir sual verilə bilər:

«Yuxarıda qeyd olunub ki, qibləyə doğru kəsməyin vacib olduğunu bilməyən şəxs heyvanı qiblədən başqa istiqamətə kəsərsə, onun əti halal olar. Amma burada "Allahın adını

[1] «Vəsailuş-şiə»; əz-zəbaih; bab 15; hədis 2
[2] «Vəsailuş-şiə»; əz-zəbaih; bab 15; hədis 4
[3] «Minhacus-salihin» Xoyi, Təbrizi c.2, məs. 1653; Xorasani c.3 məs. 1653; Sistani c.3 məs.843

çəkməyin vacib olduğunu bilməyən kəs "bismillah"sız heyvanı kəsərsə, haram olar" deyilir. Bu iki məsələnin arasındakı fərq nədən ibarətdir ki, fəqihlər bu cür fərqli nəzər söyləyirlər?»

Cavab: Əvvəla bilmək lazımdır ki, hökmə cahil olmaq mükəlləf üçün yəni boynuna şəri vəzifə gəlmiş insan üçün şəriətdə üzr sayılmır. Bu ümumi bir qaydadır. Bu qaydanın hökmündən yalnız nəss (ayə və hədis) vasitəsilə xaric olmaq mümkündür. Yəni əgər ayə və ya hədisdə həmin şəxs üzrlü sayılsa, deməli, bu qaydadan xaricdir. Əks təqdirdə isə qaydanın hökmünə daxildir. Qiblə məsələsində mükəlləf İmam Baqirdən (ə) nəql olunmuş hədis vasitəsilə üzrlü sayılır. Əgər bu barədə hədis olmasaydı, o zaman heyvanı qibləyə tərəf kəsməyin vacib olduğunu bilməyən kəs onu qiblədən başqa səmtə kəsdiyi halda əti haram sayılardı. Lakin "bismillah"ı deməyən şəxsə isə üzr gətirən hədis yoxdur. Yəni heyvanın başı üzərində Allahın adını çəkməyin vacib olduğunu bilməyən kəs əgər heyvanı "bismillah"sız kəsərsə, onun ətinin halal olması barədə hədis nəql olunmamışdır. Məhz buna görə, "bismillah" məsələsində hökmü bilməyən şəxs "hökmə cahil olmaq şəri üzr deyil" qaydasından xaric olmuş sayılmır.

Heyvanı kəsərkən Allahın adını çəkməyin vacib olduğuna əqidəsi olmayan müsəlman şəxs əgər “bismillah” deyib heyvanı üzü qibləyə kəsərsə, onun əti halal olar.[1]

Lal bir şəxs heyvanı kəsə bilər. Onun “bismillah” deməsi dilini tərpətmək və barmaqları ilə işarə etmək vasitəsilə həyata keçər.

**Qeyd:** “Bismillah” sözündən məqsədimiz heyvanı kəsərkən ümumi mənada Allahın adını çəkməkdir. Yəni yuxarıda qeyd etdiyimiz kimi “əlhəmdulillah”, “la ilahə iləllah” və s. sözlər də deyilə bilər.

3. Heyvanı kəsərkən onun boğazında dörd üzv kəsilməlidir. Onlar aşağıdakılardır:

a). Qırtlaqdan aşağı nəfəs borusu (traxeya).

b). Qida borusu.

c) və d) Qırtlaq və qida borusundan bayır tərəfdə yerləşən iki yoğun damar (sağ və sol ümumi yuxu arteriyaları).

Bu dörd üzvə dörd boğaz damarı da deyilir. Heyvanı kəsərkən bu dörd üzvün dördünü də kəsmək vacibdir. Əgər birini kəsib, o biriləri saxlasalar, heyvanın əti halal olmaz. Həmçinin heyvanın başı gərək qırtlağın ön çıxıntısının aşağı tərəfindən (nəfəs borusunun lap başlanğıcından) kəsilsin.

---

[1] «Minhacus-salihin» Xoyi, Təbrizi c.2, məs. 1637; Xorasani c.3 məs. 1637; Sistani c.3 məs.844

Əgər kimsə boynunun arxasından heyvanı kəsərsə, onun əti halal olmaz. İmam Sadiq (ə) buyurur:

**لا يصلح أكل ذبيحة لا تذبح من مذبحها**

**«Kəsilməli olan yerindən kəsilməmiş heyvanı yemək olmaz.»**[1]

Lakin *Ayətullah Sistani* «Minhacus-salihin» kitabında [2] belə yazır: «Heyvanı boynunun arxasından kəssələr, onun əti halal olar. Amma yaxşı olar ki, ehtiyata əməl edib onu boğazının ön tərəfindən kəssinlər.»[3] Bu hökmün dəlilləri ilə maraqlanmaq istəyənlər Ayətullah Seyyid Muhəmməd Sadiq Ruhaninin «Fiqhus-Sadiq» kitabına müraciət edə bilərlər. [4]

Əgər bir kəs bıçağı dörd üzvün arxasından salıb önə doğru kəsərsə, heyvanın əti haram olmaz.[5] Lakin yaxşıdır ki, bu cür əməl tərk olunsun.[6] Hətta müctehidlərdən bəziləri bu əməlin heyvanın halal olmasına kifayət etmədiyini buyururlar.[7] Heyvanın dörd üzvü o, həyatda olduğu vaxt – diriykən kəsilməlidir. [8] Ehtiyat-vacib budur ki, onlar adi

---

[1] «Vəsailuş-şiə»; əz-zəbaih; bab 4; hədis 3
[2] «Minhacus-salihin» c.3 məs.852
[3] Amma dörd damar kəsilərkən heyvan diri olmalıdır.
[4] «Fiqhus-Sadiq» 24-cü cild, səh. 41
[5] «Minhacus-salihin» Sistani, c.3 məs.852
[6] «Fiqhul-İmam Cəfəris-Sadiq» c.4, səh.352
[7] «Minhacus-salihin» Xoyi, Təbrizi c.2, məs. 1656; Xorasani c.3 məs. 1656
[8] Deməli murdar olmuş heyvanın dörd üzvünü kəssələr belə, halal olmaz.

qaydada dalbadal kəsilsin.[1] Əgər bəzisini ölməmişdən qabaq, qalanını isə can verdikdən sonra kəssələr, heyvanın əti haram olar.

Heyvanın (quşlar istisna olmaqla) başını can verməmişdən əvvəl bədənindən ayırsalar, onun əti haram olar. Quşun başını isə can verməmişdən qabaq qəsdən bədənindən ayırmaq haram olsa da, zahir nəzər budur ki, həmin quşun əti halaldır.[2]

Ayətullah Seyyid Sistani isə bir qədər fərqli fikir bildirir: "Heyvanın başını can verməmişdən qabaq bədənindən ayırsalar, ətinin haram olmasına səbəb olmaz. Lakin bu əməl öz-özlüyündə vacib-ehtiyata əsasən haramdır. Bu məsələdə quş və dörd ayaqlılar arasında heç bir fərq yoxdur."[3] İmam Sadiq (ə) buyurur:

**لا يكسر الرقبة حتى تبرد الذبيحة**

**«(Heyvan kəsən şəxs gərək) heyvan soyumamış (canı çıxmamış) onun boynunu sındırmasın.»**[4]

Əgər bunu bilməyərəkdən edərsə və ya bu, bıçağın çox iti olmasına görə baş verərsə, heç bir eybi yoxdur. İmam Baqir (ə) ondan, heyvanı kəsərkən tələsib başını

---

[1] «Tovzihul-məsail» Xorasani, məs. 2656;
[2] «Minhacus-salihin» Xoyi, Təbrizi c.2, məs. 1658-1659; Xorasani c.3 məs. 1658-1659
[3] «Minhacus-salihin» Sistani, c.3 məs.851
[4] «Vəsailuş-şiə»; əz-zəbaih; bab 15; hədis 3

bədənindən tez ayıran bir kişi haqqında soruşanlara buyurdu:

إن خرج الدم فكل

**«Əgər qanı xaric olarsa, (onun ətindən) yeyə bilərsən.»**[1]

Həmçinin vacib-ehtiyata əsasən, heyvan can verməmiş fəqərə sümüklərinin içində yerləşən onurğa beyini (nuxa) adlanan iliyi yarıb çıxarmaq da caiz deyildir.

Əgər canavar, ya başqa bir yırtıcı heyvan, məsələn, qoyuna hücum edib onun boynunu parçalasa və nəticədə kəsilməli olan dörd üzvdən heç bir şey qalmasa, sonradan boğazının qalan hissəsini üzü qibləyə "bismillah"la kəssələr, belə onun əti halal olmaz. Kəsilməli olan üzvlər qalmaq şərti ilə əgər qoyunun boynunu, məsələn, arxadan parçalasa, ya bədəninin digər bir hissəsini yırtarsa və qoyun da diri qalarsa, şəri qaydalara əsasən başını kəssələr, onun əti halal olar.

4. Ehtiyat-vacibə əsasən, heyvan kəsildikdən sonra ondan bədəninə münasib olaraq adi miqdarda qan axmalıdır. Bəzi fəqihlərə görə bu hökm heyvanın diri olduğuna şəkk edildiyi hala aiddir. Bəzi fəqihlər isə bunu

[1] «Vəsailuş-şiə»; əz-zəbaih; bab 9; hədis 2

ümumi mənada hər iki hala aid edirlər.[1] Yəni heyvanın diri olduğuna istər şəkk olunsun, istər şəkk olunmasın, əgər ondan öz növünə münasib olan miqdardan az qan çıxarsa, ya qan damarlarında laxtalanıb qalarsa, onun əti haram olar. Amma az qan axması heyvanın başını kəsməzdən əvvəl qan itirdiyinə görə olarsa, eybi yoxdur.

5. Heyvan başı kəsildikdən sonra gözünü, qulağını ya quyruğunu tərpətməklə, ya ayaqlarını yerə vurmaqla hərəkət etməlidir. Bu hökm heyvanın diri olduğunun bilinmədiyi hala aiddir. Əks təqdirdə isə buna heç bir lüzum yoxdur. İmam Sadiqdən (ə) bu haqda soruşdular və İmam (ə) belə cavab verdi:

**إذا تحرك الذنب أو الطرف أو الأذن فهو ذكي**

**«Əgər quyruq, göz və ya qulağını hərəkət etdirərsə, halaldır.»**[2]

## MƏSƏLƏ

Sərçə kimi kiçik quşların başını kəsmədən üzsələr, onun əti haram olar. Heyvan kəsimində olan bütün şərtlər bu cür kiçik quşlara da şamildir. Yəni onları da üzü qibləyə, "bismillah"la dəmirdən olan alət vasitəsilə kəsmək lazımdır.

---

[1] «Minhacus-salihin» Xoyi, Təbrizi c.2, məs. 1656; Xorasani c.3 məs. 1656; Sistani c.3 məs.850

[2] «Vəsailuş-şiə»; əz-zəbaih; bab 11; hədis 3

## NƏHR

Dəvənin kəsilmə qaydasına nəhr deyilir. Nəhr ancaq dəvəyə məxsusdur. Əgər, məsələn, qoyunun kəsilmə qaydası ilə dəvəni kəssələr, onun əti halal olmaz. Həmçinin dəvədən qeyri heyvanları nəhr etsələr, onların da əti halal olmaz. İmam Sadiq (ə) buyurur:

كل منحور مذبوح حرام ، وكل مذبوح منحور حرام

**«Nəhr edilməli olan heyvan kəsilsə, kəsilməli olan heyvan isə nəhr edilsə haramdır.»**[1]

Nəhrin qaydası: Dəvənin mənhəri (nəhr yeri) onun sinəsi ilə boynu arasında olan çökək nahiyədir. Onu nəhr etmək üçün dəmirdən olan kəsici bir aləti dəvənin mənhərinə batırmaq lazımdır. Heyvanın başını kəsmək üçün yuxarıda qeyd etdiyimiz bütün şərtlər nəhr məsələsinə də aiddir. Yəni dəvənin üzü qibləyə olması, nəhr edənin müsəlman olması, nəhr edərkən “bismillah” deməsi, dəmir alətdən istifadə etməsi, nəhr zamanı heyvanın diri olması, adi miqdarda qanın çıxması kimi şərtlər bu məsələdə də mötəbərdir. Dəvə nəhr olunarkən onun mənhəri və bədəninin ön hissəsi qibləyə tərəf olmalıdır. Dəvənin ayaq üstə olması daha yaxşıdır. Amma (bədəninin ön tərəfi qibləyə doğru olmaq şərti ilə) dizlərinin yerə qoyulmasının, ya böyrü üstə uzadılmasının da eybi yoxdur. Nəhr edərkən qibləni səhv

---

[1] «Vəsailuş-şiə»; əz-zəbaih; bab 5; hədis 3

salmaq, unutmaq, ya hökmü bilməmək, həmçinin bismillahı unutmaq kimi məsələlər heyvanın başını kəsmək məsələlərində qeyd edildiyi kimidir. Təkrar olaraq şərh etməyə lüzum görmürük.

Əgər dəvənin başını ( dörd üzvünü) kəssələr amma canı çıxmamış deyilmiş qaydada nəhr etsələr, halal olar.

## HEYVANIN QARNINDAKI BALA

Peyğəmbər (s) buyurur:

ذكاة الجنين ذكاة أمه

**«(Anasının qarnında olan) balanın təzkiyəsi anasının təzkiyə edilməsi ilə olar.»**[1]

Hədisin mənası budur ki, qarnında balası olan heyvanı şəri qaydalara əsasən kəssələr, özü ilə birlikdə balası da halal olar. Lakin bunun iki şərti vardır:

1. Bala anasının bətnində öz növünə uyğun olaraq tam formalaşmalı, bədəni tüklə örtülməlidir. İmam Sadiqdən (ə) bu məsələ haqqında soruşdular və İmam (ə) buyurdu:

إذا كان تماما ونبت عليه الشعر فكل

**«Əgər tam şəkildə formalaşmış və tükləri çıxmış olsa, yeyə bilərsən.»**[2]

---

[1] «Cəvahirul-kəlam»; c.36; səh. 180
[2] «Vəsailuş-şiə»; əz-zəbaih; bab 18; hədis 1

2. Bala anasının qarnından çıxarıldıqda artıq ölmüş olmalıdır. Şəri yolla kəsilmiş heyvanın bətnində ölən bala haqqında İmam Sadiqdən (ə) soruşdular. İmam (ə) buyurdu:

**كله فإنه حلال لان ذكاته ذكاة أمه فان هو خرج وهو حي فاذبحه وكل فان مات قبل أن تذبحه فلا تأكله**

**«Onu yeyə bilərsən. Çünki onun təzkiyəsi anasının təzkiyə edilməsi ilə olur. Əgər diri halda (anasının bətnindən) çıxardılsa, onu (əvvəlcə şəri qayda ilə ) kəs və sonra ye! Əgər o, (diri çıxan bala) sən kəsməmiş özü ölərsə, yemə!»**[1]

Deməli, əgər, bala çıxarıldıqda diri olarsa, onun halal olması üçün hökmən şəri qaydada başı kəsilməlidir. Əks təqdirdə yeyilməsi haramdır. Əgər heyvan kəsilən zaman qarnındakı bala diri qalarsa, ananın qarnını yarıb balanı çıxartmağa tələsilməlidir. Əgər bunu etməsələr və heyvanın qarnını yarmağı adi miqdardan çox kecikdirsələr və nəticədə, bala çıxarılmamışdan qabaq ölsə, haram olar. [2]

**Qeyd:** Əgər ümumiyyətlə heyvan kəsilməmişdən öncə qarnındakı bala ölərsə, bu halda həmin balanın əti haram olar. [3]

---

[1] «Vəsailuş-şiə»; əz-zəbaih; bab 18; hədis 8

[2] «Minhacus-salihin» Xoyi, Təbrizi c.2, məs. 1666; Xorasani c.3 məs. 1666; Sistani c.3 məs.863;

[3] Ayətullah Sistani “Kənzul-fətava” sual.56 *www.alseraj.net*

## ŞƏRİ QAYDAYA RİAYƏT ETMƏK MÜMKÜN DEYİLSƏ

1. İmam Sadiq (ə) buyurur: Bir gün Peyğəmbərdən (s) soruşdular:

**فقالوا : إن بقرة لنا غلبتنا ، واستصعبت علينا ، فضربناها بالسيف ، فأمرهم بأكلها**

**«(Kəsmək istədiyimiz) inək bizə güc gəldi və boyun əymədi. Biz də onu qılıncla vurduq (bu halda o, halal olurmu)? Peyğəmbər (s) göstəriş verdi ki, onun ətindən yeyə bilərsiniz.»**[1]

Bu və bu kimi hədislərə istinad edərək fəqihlər buyururlar: Əgər bir heyvan ipə-sapa yatmayıb sahibinə tabe olmazsa və heyvanı tutub kəsmək mümkün olmazsa, onda onu qılınc, bıçaq və s. ov alətləri ilə öldürmək olar.[2] Əlbəttə, heyvan kəsimində qeyd etdiyimiz digər şərtlərə (Allahın adını zikr etmək və qəssabın şərtlərinə) riayət olunmalıdır. Bu cür heyvan ov aləti ilə vurulduqdan sonra başını kəsməyə imkan olmadığı təqdirdə ölsə, halaldır.

2. Fərz edək ki, heyvan quyuya düşüb, ya elə bir dar yerdədir ki, onu nə qibləyə çevirmək, nə boğazından kəsmək, nə də düşdüyü yerdən çıxartmaq mümkündür. Bu

[1] «Vəsailuş-şiə»; əz-zəbaih; bab 10; hədis 3
[2] Ov alətləri dedikdə şəriətdə mötəbər sayılan ov alətləri nəzərdə tutulur.

halda heyvanı bıçaqla istənilən yerindən yaralayıb öldürmək olar. Amma Allahın adı çəkilməsə, əti halal olmaz. İmam Sadiq (ə) bu cür heyvan haqqında buyurur:

فلم يقدر على منحرها ، فلينحرها من حيث يقدر عليه، ويسمى الله عليها وتؤكل

**«Onu (şəri qayda ilə) boğazından kəsmək mümkün olmadıqda, Allahın adı çəkilərək nə cür mümkündürsə elə də kəsilsin. Sonra (onu) yemək olar.»**[1]

## QURBAN

Qurban bayramında heyvan kəsmək həcc mərasimini çıxmaq şərti ilə müstəhəbb bir əməldir. Lakin bu əmələ çox təkid edilmişdir. Əmirəl-möminin İmam Əli (ə) buyurur:

لو علم الناس ما في الأضحية لاستدانوا وضحوا ، إنه ليغفر لصاحب الأضحية عند أول قطرة تقطر من دمها

**«Əgər insanlar qurban kəsməkdə nələr olduğunu bilsəydilər, borc belə olsa, alıb qurban kəsərdilər. Həqiqətən, bu əməl heyvanın boynundan axan qanın birinci qətrəsində qurban kəsənin bağışlanmağına səbəb olar.»**[2]

---

[1] «Vəsailuş-şiə»; əz-zəbaih; bab 10; hədis 8
[2] «Vəsailuş-şiə»; c.14, əbvabuz-zibh; bab 64; hədis 2

Qurban kəsmə günləri zil-hiccə ayının onu (qurban bayramı), on biri və on ikisidir. Qurban kəsməyin ən fəzilətli zamanı isə günəş çıxdıqdan sonra bayram namazını qılmaq üçün lazım olan miqdarda vaxt keçdikdən sonradır. Peyğəmbər (s) buyurur:

**من ذبح قبل الصلاة فإنما يذبح لنفسه ، ومن ذبح بعد الصلاة فقد تم نسكه وأصاب سنةالمسلمين**

**«(Qurbanlıq heyvanı) bayram namazından əvvəl kəsən şəxs onu yalnız özü üçün kəsmişdir. Namazdan sonra kəsən isə, dini ayini tamamlayıb, müsəlmanların yolunu getmişdir.»**[1]

Müstəhəbdir ki, qurban ətini üç hissəyə bölsünlər. Bir hissəsini qurban kəsən şəxsin özü və ailəsi yesin, bir hissəsi qohum-əqrəba və qonşulara hədiyyə verilsin, digər üçdə bir hissəsi isə ehtiyaclılara sədəqə edilsin. Hədislərdə nəql olunur ki, İmam Zeynul-Abidin (ə) oğlu İmam Muhəmməd Baqirlə (ə) birlikdə qurban ətinin üçdə birini qonşulara, digər üçdə birini ehtiyaclılara sədəqə edər, qalan hissəsini isə öz ailələri üçün saxlayardılar. [2]

---

[1] «Məsalikul-əfham» c.11 səh.487
[2] «Fiqhul-İmam Cəfəris-Sadiq» c.2, səh.231

Müstəhəbdir ki,[1] qurbanlıq dəvə beş, inək və keçi isə iki yaşını tamamlamış olsun. Qoyun isə yaxşı olar ki, yeddi ayını tamamlayıb səkkizinci ayına keçmiş olsun. Həmçinin müstəhəbdir ki, qurbanlıq heyvan axsaq, qulağı kəsik, buynuzu sınıq, bir gözü kor və s. çatışmamazlıqlara malik olmasın.

## NƏZİR ETMƏKLƏ VACİB OLMUŞ QURBAN

Ümumiyyətlə, nəzir odur ki, insan Allah rizası üçün xeyirli bir iş görməyi özünə vacib etsin. Məsələn, qurban kəsməyi nəzir etsə, artıq bu ona vacib olar.

İnsan qurban kəsmək üçün iki cür nəzir edə bilər. Birincisi budur ki, məsələn, belə deyə: “Nəzir edirəm ki, xəstəm sağalsa, Allah üçün qurban kəsəm.” İkincisi budur ki, öz mülkündən olan müəyyən bir heyvanı, məsələn, qoyunu göstərib deyə: “Nəzir edirəm ki, xəstəm sağalsa, Allah üçün bu heyvanı qurban kəsəm.” Hər iki halda əgər həmin şəxsin xəstəsi sağalarsa, ona vacibdir ki, qurban kəssin. Amma birinci halda heyvan seçməkdə ixtiyar sahibidir. İkinci halda isə, hansı heyvanı nəzir üçün təyin edibsə, elə o heyvanı da kəsməlidir. Əgər başqa bir heyvanı kəsərsə, nəzir onun

[1] Söhbət müstəhəbb olan qurbandan gedir. Minada kəsilən qurbanlıq heyvanlarda isə bu sifətlərin olması vacibdir.

boynundan götürülməz. Şeyx Nəcəfi (r.ə.) öz kitabında belə bir hədis qeyd edir:

**إن رجلا قال للنبي ( صلى الله عليه وآله ) : يا رسول الله إني أوجبت على نفسي بدنة وهي تطلب مني بنوق ، فقال : انحرها ولا تبعها ولو طلبت بمأة بعير**

**«Bir kişi Peyğəmbərə (s) dedi: "Ey Allahın Rəsulu! Mən özümə bir inək qurban kəsməyi vacib etmişəm. Amma nəfsim məndən dəvə kəsməyi tələb edir." Peyğəmbər (s) buyurdu: "Nəfsin səndən yüz dəvə belə istəsə, ona tabe olma! (Nəzir etdiyin) inəyi kəs."»**[1]

İkinci hal haqqında fəqihlər yazırlar:

"Nəzir etdiyi andan qurban üçün təyin elədiyi heyvan həmin şəxsin mülkiyyətindən xaric olub miskin və ehtiyaclıların əmanətinə çevrilər. Ona vacibdir ki, əmanətə vəfa edib kəsiləcək günə qədər həmin heyvanı saxlasın. Amma səhlənkarlıq və etinasızlıq üzündən olmamaq şərtiylə heyvan tələf olarsa, nəzir edənin boynuna heç bir şey vacib deyildir. Hətta, tələf olmuş heyvanın yerinə başqa bir heyvan kəsməsi belə vacib deyildir."[2]

---

[1] «Cəvahirul-kəlam»; c.36; səh. 153
[2] «Fiqhus-Sadiq» c.12, səh.104

## ƏQİQƏ

Müstəhəbdir ki, yeni doğulmuş uşağın yeddinci günündə heyvan kəsilsin. Buna fiqh elmində “əqiqə etmək” [1] deyilir. Əgər üzrlü yaxud üzrsüz səbəbə görə körpənin yeddinci günündə əqiqə etməsələr, onu sonrakı günlərdə də edə bilərlər. Hətta bir kəsin uşaqlıq dövründə onun üçün əqiqə etməsələr müstəhəbdir ki, həddi buluğa çatdıqdan sonra özü özü üçün əqiqə etsin.[2]

Qurbanda deyilmiş şərtlər əqiqədə də mövcuddur (yəni heyvanın qüsursuz olmağı, yaşı [3] və s.). [4] Əqiqə olaraq qoyun, keçi, inək və ya dəvə kəsilməlidir.[5] Lakin ən yaxşısı budur ki, qoyun kəsilsin.[6] İmam Cəfər Sadiq (ə) buyurur:

إنما هي شاة لحم ليست بمنزلة الأضحية يجزي منها كل شئ وخيرها أسمنها

**"O (əqiqə) qoyun ətindəndir. Qurbanın yerində deyil. Hər hansı bir qoyun olsa kifayətdir. Lakin ən xeyirlisi ən yağlı olanıdır."**[7]

---

[1] Fiqhi termində “əqiqə” ilə “qurban” anlayışları fərqli olduqları üçün biz burada bu sözü “qurban kəsmək” yox, “əqiqə etmək” kimi qeyd etmişik.

[2] «Minhacus-salihin» Sistani c. 3 məs. 394; Xoyi, Təbrizi, c. 2 məs. 1384; Xorasani c.3 məs. 1384;

[3] Dəvədə altı yaşa, inəkdə iki yaşa, qoyunda isə səkkizinci aya daxil olmağı.

[4] «Şərhi-lümə» cild 2. səh. 482

[5] «Minhacus-salihin» Sistani c. 3 məs. 394

[6] «Minhacus-salihin» Xoyi, Təbrizi, c. 2 məs. 1383; Xorasani c.3 məs. 1383;

[7] «Şərhi-lümə» cild 2. səh 482

Əgər körpə oğlan uşağıdırsa erkək heyvan, qız uşağıdırsa dişi heyvan kəsilməsi müstəhəbdir. İmam Cəfər Sadiq (ə) buyurur:

**إذا كان يوم السابع وقد ولد لأحدكم غلام أو جارية فليعق عنه كبشا عن الذكر ذكرا وعن الأنثى مثل ذلك عقوا عنه**

**«Əgər sizlərdən birinin oğlan yaxud qız uşağı doğularsa onun yeddinci günündə oğlan uşağı üçün erkək, qız uşağı üçün isə dişi bir qoyunu əqiqə edin.»** [1]

Müstəhəbdir ki, əqiqə ediləcək heyvanın əti yağlı olsun. [2] Həmçinin əvvəlki səhifədə qeyd etdiyimiz hədis də buna dəlalət edir.

Müstəhəbdir ki, əqiqə kəsilərkən hədislərdə nəql olunmuş dualardan oxunsun. O dualardan biri də aşağıda qeyd olunmuş duadır.

Kərxinin İmam Cəfər Sadiq (ə)-dan nəql etdiyi dua:

**بسم الله وبالله اللهم هذه عقيقة عن فلان لحمها بلحمه، ودمها بدمه، وعظمها بعظمه، اللهم اجعله وقاء لآل محمد صلى الله عليه وآله**

**"Bismillah və billah, Allahummə hazihi əqiqətun ən fulanin ləhmuha biləhmihi, dəmuha bidəmihi, əzmuha**

---

1 «Fiqhus-Sadiq» c.22, səh.286

2 «Minhacus-salihin» Sistani c. 3 məs. 394

**biəzmihi. Allahummə ic'əlhu viqaən li ali Muhəmmədin sallallahu əleyhi və alihi"**[1]

Buradakı "fulanin" kəlməsinin yerinə əqiqə kəsilmiş uşağın adı qeyd olunmalıdır.

Əqiqəni onun qiyməti qədər sədəqə ilə əvəz etmək olmaz. Əgər əqiqə etmək mümkün olmasa bu zaman mümkün olacaq vaxta qədər gözləməli imkan tapan kimi isə əqiqə etməlidir.

İmam Sadiqdən (ə) soruşdular:

**إنا طلبنا العقيقة فلم نجدها فما ترى نتصدق بثمنها**

**فقال عليه السلام :لا، إن الله تعالى يحب إطعام الطعام، وإراقة الدماء**

**"Biz əqiqə axtardıq lakin tapa bilmədik. Onun pulunu sədəqə verməyimiz barədə nəzəriniz nədir?"**

**İmam Sadiq (ə) buyurdu: "Xeyr. Həqiqətən Allah (əqiqədə) yemək yedirilməyini və qan axıdılmağını (heyvanın kəsilib ehsan edilməsini) sevir."**[2]

Müstəhəbdir ki, ətin dörddə bir hissəsi mamaçaya verilsin. [3] Həmin hissənin ayaq və bud tərəfdən olması

---

1 «Şərhi-lümə» cild 2. səh. 482
2 «Şərhi-lümə» cild 2. səh. 483
3 «Minhacus-salihin» Xoyi, Təbrizi, c. 2 məs. 1383; Xorasani c.3 məs. 1383; Sistani c. 3 məs. 395

müstəhəbdir.[1] Əgər mamaça olmasa o zaman ona düşən payı ana sədəqə versin. Əqiqəni ata kəssə belə yenə də həmin payı ananın sədəqə verməsi müstəhəbdir. Hədislərdə qeyd olunanlara əsasən əqiqəni yalnız fəqirə sədəqə vermək lazım deyil. Onu istənilən şəxsə vermək olar.[2]

Həmin heyvanın ətindən atanın və onun ailəsinin yeməsi məkruhdur. Ehtiyata əsasən ana onu yeməkdən çəkinməlidir. [3] *Ayətullah Sistani* ananın o ətdən yeməsini məxsusi şəkildə məkruh bilir. [4] İmam Cəfər Sadiq (ə) buyurur:

**لا يأكل هو ولا أحد من عياله من العقيقة**

**«Əqiqə edilmiş heyvandan kişi (uşağın atası) və onun ailəsindən olan heç kəs yeməsin.»** [5]

Yaxşı olar ki, ətin qalan hissəsi qaynadılaraq bişirilsin və qonaqlıq təşkil olunaraq möminlər dəvət olunsun. Daha yaxşı olar ki, möminlərin sayı ən azı on nəfər olsun.[6]

---

1 «Minhacus-salihin» Sistani c. 3 məs. 395
2 «Şərhi-lümə» cild 2. səh. 483
3 «Minhacus-salihin» Xoyi, Təbrizi, c. 2 məs. 1383; Xorasani c.3 məs. 1383;
4 «Minhacus-salihin» Sistani c. 3 məs. 394
5 «Fiqhus-Sadiq» c.22, səh.291
6 «Minhacus-salihin» Xoyi, Təbrizi, c. 2 məs. 1383; Xorasani c.3 məs. 1383; Sistani c. 3 məs. 395

İmam Sadiq (ə) buyurur:

**يطعم منه عشرة من المسلمين، فإن زاد فهو أفضل**

**"Ondan (əqiqədən) on möminə yedirilər. Əgər (onların sayı) daha çox olsa daha da fəzilətlidir."**[1]

Əqiqə olunmuş heyvanın sümüyünü sındırmaq məkruhdur. Bunun əvəzinə sümükləri oynaqlardan bir-birindən ayırarlar.[2] Bəzi yerlərdə əqiqə olunmuş heyvanın sümüyünü yığıb bir parçaya bükərək dəfn edirlər. Lakin bilmək lazımdır ki, bu əməlin şəri cəhətdən bəyənilən bir iş olmasına dəlalət edən heç bir dəlil yoxdur. [3]

## HEYVAN KƏSƏRKƏN MÜSTƏHƏBB OLAN ƏMƏLLƏR

Heyvan kəsərkən bir neçə əməl müstəhəbbdir. Onlar aşağıdakılardır:

1. Məsumlardan (ə) nəql olunmuş hədislərə[4] əsasən, qoyunun başını kəsərkən onun qabaq ayaqlarının hər ikisini, arxa ayaqlarının isə birini bağlayıb digərini açıq saxlamaq, inəyin başını kəsərkən dörd ayağını bağlayıb quyruğunu sərbəst buraxmaq, dəvəni kəsərkən oturan halda iki qabaq

---

[1] «Şərhi-lümə» cild 2. səh.484

[2] «Şərhi-lümə» cild 2. səh.483

[3] «Minhacus-salihin» Xoyi, Təbrizi, c. 2 məs. 1383; Xorasani c.3 məs. 1383;

[4] «Vəsailuş-şiə»; əz-zəbaih; bab 3; hədis 2

ayağını aşağıdan dizə qədər bağlayıb arxa ayaqlarını açıq saxlamaq, toyuğu kəsdikdə isə çırpınması üçün sərbəst buraxmaq.

2. Heyvan kəsən şəxsin üzü qibləyə olması.

3. Heyvanı kəsməmişdən əvvəl onun qabağına su qoymaq.

4. Heyvanın əziyyətini azaldan işlər görmək, məsələn, bıçağı yaxşı itiləmək, başını sürətlə kəsmək və s. İslam Peyğəmbəri (s) buyurur:

إذا ذبحتم فأحسنوا الذبحة

**«Heyvan kəsərkən ona yaxşılıq edin.»**[1]

## HEYVAN KƏSƏRKƏN MƏKRUH OLAN ƏMƏLLƏR

Bəzi hədislərə görə, heyvan kəsimində bir neçə şey məkruhdur:

1. Heyvan can verməmiş onun dərisini soymaq. Lakin bəzi fəqihlər vacib-ehtiyata əsasən, bu işi tərk etməyi buyururlar.[2]

2. Heyvanı öz növündən olan başqa bir heyvanın görəcəyi yerdə kəsmək.

---

[1] «Cəvahirul-kəlam»; c.36; səh. 134

[2] «Tovzihul-məsail»; Xorasani məs. 2664

Əmirəl-möminin İmam Əli (ə) buyurur:

**لا تذبح الشاة عند الشاة وهو ينظر إليه**

**«Qoyunu ona baxan başqa bir qoyunun yanında kəsmə!»**[1]

3. Zərurət olmadığı təqdirdə heyvanı gecə vaxtı kəsmək.

İmam Sadiq (ə) buyurur:

**كان علي بن الحسين ( عليهما السلام ) يأمر غلمانه أن لا يذبحوا حتى يطلع الفجر**

**«İmam Səccad (ə) öz qulamlarına əmr edərdi ki, sübh olmayınca, heyvan kəsməsinlər.»**[2]

4. Həmçinin, zərurət olmadığı təqdirdə cümə günü zöhrdən qabaq heyvan kəsmək. Hədislərdə nəql olunur ki, zəruri hal olmadıqda Peyğəmbərimiz (s) cümə günü zöhrdən qabaq heyvan kəsməyi bəyənməzdi.[3]

5. İnsanın özü bəslədiyi heyvanı kəsməsi. Məsumlardan (ə) nəql olunmuş hədislərə əsasən, bu əməl qəlbin daşlaşmasına səbəb olar.[4]

---

1 «Cəvahirul-kəlam»; c.36; səh. 137

2 «Vəsailuş-şiə»; əz-zəbaih; bab 21; hədis 1

3 «Vəsailuş-şiə»; əz-zəbaih; bab 20; hədis 1

4 «Cəvahirul-kəlam»; c.36; səh. 138

## BAZARLARDAN ALINAN ƏTLƏRİN HÖKMÜ

Fərz edək ki, bir şəxs müsəlman ölkəsində bazardan şəri qaydalara əsasən kəsilib-kəsilmədiyindən xəbərsiz olduğu heyvanın ətini alır. Bu halda həmin şəxs neyləməlidir? O ətdən alıb yeməsi caizdirmi? İmam Baqir (ə) buyurur:

كل إذا كان ذلك في سوق المسلمين ، ولا تسأل عنه

**«Əgər o ət müsəlmanların bazarındadırsa, yeyə bilərsən. Onun (halal olması) barədə (satıcıdan, ya qəssabdan) heç nə soruşma!»**[1]

Şeyx Nəcəfi (r.ə.) İmamın (ə) "soruşma!" sözünün mənası haqqında yazır: «Soruşmaq müstəhəbb deyil, hətta, bəlkə, məkruhdur.»[2]

Gördüyünüz kimi hədisdə İmam Baqir (ə) bazarlardan alınan ətin halal sayılması üçün müsəlman bazarından olmasını şərt bilir. Bu o deməkdir ki, əgər bir şəxs kafir bazarından ət alarsa, o haram hökmündədir. Bu ət yalnız o vaxt halal olar ki, heyvanın şəri qaydada kəsildiyinə alıcının şübhəsi qalmasın. Məsələn, iki nəfər adil şəxs şəhadət verələr ki, bəli biz heyvanın şəri qaydada kəsildiyini görmüşük.

Bu dediyimiz məsələlər o hala aiddir ki, insan heyvanın şəri qaydalara əsasən kəsildiyini bilməsin. Əgər alıcı

---

[1] «Vəsailuş-şiə»; əz-zəbaih; bab 21; hədis 1

[2] «Cəvahirul-kəlam»; c.36; səh. 138

heyvanın şəri yolla müsəlman tərəfindən kəsildiyini bilirsə, əti istər müsəlmandan alsın, istərsə də kafirdən o ət mübahisəsiz olaraq halaldır.

## XARİCİ ÖLKƏLƏRDƏN GƏTİRİLƏN ƏTLƏRİN HÖKMÜ

Xarici ölkələrdən gətirilən ətlərin hökmü də eynən bazarlardan alınan ətlərin hökmü kimidir. Əgər müsəlman ölkəsindən, məsələn, türkiyədən bizim ölkəyə ət gətirilərsə, onun şəri yolla kəsilib-kəsilməməyini araşdırmağa heç bir lüzum yoxdur. Həmin ət halal hökmündədir. Əgər ət kafir ölkəsindən, məsələn, Braziliyadan gətirilərsə, üzərində halal yazılsa belə,[1] haram hökmündədir. Lakin onun halallığına şəri bəyyinə olarsa, yəni məsələn, iki nəfər adil şəxs həmin heyvanların şəri qayda ilə kəsildiyinə şəhadət versələr, o halal sayılar.

Bəs, görəsən, Hindistan kimi, əhalisinin əksəri kafir, az hissəsi isə müsəlman olan ölkələrdən gətirilən ətlərin hökmü necədir?

Cavab: Məsumlardan (ə) nəql olunmuş hədislərdən çıxan nəticə[2] budur ki, əhalisinin əksəri müsəlman olan ölkələrdən gətirilimiş ətlər halal, əksəri kafir olan ölkələrdən gətirilmiş ətlər isə haram hökmündədir. Deməli, əgər Hindistan kimi

---

[1] Ayətullah Xoyi «Munyətus-sail» səh.178

[2] «Fiqhus-Sadiq» c.24, səh.62

bir ölkədən ət gətirilərsə, və onun şəri qayda ilə kəsildiyi bilinməzsə, üzərində halal yazılsa belə, haramdır.

Bəs əgər həmin ətlər Hindistan kimi əhalisinin əksəri kafir olan ölkənin müsəlmanlar yaşayan ərazisindən gətirilərsə, hökmü necədir?

Cavab: Əgər ətin məhz həmin ərazidən gətirilməsinə şəri bəyyinə olarsa, halaldır. Yəni məsələn, iki nəfər adil[1] şəxs desə ki, bəli, biz bu ətlərin müsəlmanlar yaşayan ərazidən gətirildiyini görmüşük, onda həmin ətlər halal hökmündədir.

Yenə də qeyd edirik ki, bu məsələlər heyvanın şəri qaydalara əsasən kəsilib-kəsilmədiyinin bilinmədiyi hala aiddir. Əgər heyvanın şəri yolla müsəlman tərəfindən kəsildiyi bilinirsə, ətin müsəlmandan və yaxud kafirdən alınmasından asılı olmayaraq o ət mübahisəsiz olaraq halaldır.

**-Son-**

*Bütün həmdlər aləmlərin Rəbbi olan Allaha məxsusdur. Allahın rəhmət və bərəkəti yaradılmışların ən xeyirlisi və peyğəmbərlərin sonuncusu Həzrət Muhəmmədə (səlləllahu əleyhi və alihi və səlləm) və onun pak Əhli-beytinə (ə.s.) olsun. Allah-Təala bu xırda əməlimizi aşiqlərin məşuqu,*

---

[1] Adil o şəxsə deyərlər ki, Allahın vacib etdiklərini yerinə yetirsin haram etdiklərindən isə çəkinsin.

*intizarda olan gözlərin nuru, möminlərin ağası Həzrət Vəliyyi-Əsr İmam Məhdi Sahibəl-Əsr vəz-Zəmana (ə.f.) xatir bizlərdən qəbul etsin. Laiq olmasaq da, boynumuza minnət qoyaraq Kərbəla şəhidi Həzrət Əbu Əbdillahil-Hüseynin (ə.s.) ziyarətini, axirətdə isə şəfaətini nəsib etsin. Amin!*

***Əli Abdullah***

***25 Mart 2012***

***2 Cəmadiul-əvvəl 1433***

## İSTİFADƏ OLUNMUŞ ƏDƏBİYYAT


1. ***«Qurani-Kərim»***, *Azərbaycan dilinə tərcüməsi. Mütərcimlər: Z.M. Bünyadov və V.M. Məmmədəliyev, Bakı*

2. ***«Qurani-Kərim»***, *Azərbaycan dilinə tərcümə və şərhi. Mütərcim: Ağabala Mehdiyev, Bakı, 2005.*

3. ***«Fiqhul-imam Cəfəris-Sadiq»***, *Muhəmməd Cavad Muğniyyə, "Sibteyn", Qum, 1425 h.q.*

4. ***«Cəvahirul-Kəlam»***, *Şeyx Muhəmməd Nəcəf1i Cəvahiri, "Darul-kutubil-islamiyyə", Tehran, 1369 h. ş.*

5. ***«Məsalikul-əfham»***, *Şəhid Sani, "Müəssisətul-məarifil-islamiyyə", Qum, 1413 h. q.*

6. ***«Rovzətul-bəhiyyə»***, *("Şərhi-Lümə" adı ilə məşhurdur) Şəhid Sani, "Dar ət-təfsir", Qum, 1426 h. q.*

7. ***«Fiqhus-Sadiq»***, *Ayətullah Seyyid Sadiq Ruhani, "Mədrəsətul-İmam Sadiq", Qum, 1412 h. q.*

8. ***«Munyətus-sail»***, *Ayətullah Seyyid Əbul-Qasim Xoyi, "Məktəbətu-əhli-beyt" kitabxanası, çap ili: 1991 miladi.*

9. *«**Əl-fiqhu lil-muğtərib min siratin-nəcat**», Ayətullah Şeyx Cavad Təbrizi*

10. *«**Əl -fiqhu lil-muğtəribin**», Ayətullah Seyyid Əli Sistani, "Məktəbətu-əhli-beyt" kitabxanası.*

11. *«**İstiftaat**», Ayətullah Seyyid Əli Sistani, "Məktəbətu-əhli-beyt", çap ili: 2000 miladi.*

12. *«**Məsailul-muntəxəbə**», Ayətullah Seyyid Əli Sistani, "məktəbu Ayətullah Sistani", Qum, 1993 m.*

13. *«**Minhacus-salihin**», Ayətullah Seyyid Əbul-Qasim Xoyi, "Mədinətul-elm" , Qum, 1410 h.q.*

14. *«**Minhacus-salihin**», Ayətullah Şeyx Cavad Təbrizi, "Darus-siddiqətuş-şəhidə", Qum.*

15. *«**Minhacus-salihin**», Ayətullah Şeyx Vəhid Xorasani, "Mədrəsətul-İmam Baqiril-ulum", Qum, 1428 h. q.*

16. *«**Minhacus-salihin**», Ayətullah Seyyid Əli Sistani, "Müərrixul-ərəbi", Beyrut, 2006 m.*

17. *«**Tovzihul-məsail»,** Ayətullah Seyyid Əbul-Qasim Xoyi, "Məktəbətu Əhli-beyt", Qum, 1412 h. q.*

18. *«**Tovzihul-məsail**» Ayətullah Şeyx Cavad Təbrizi, "Məktəbətu Əhli-beyt", Qum.*

19. ***«Tovzihul-məsail»**, Ayətullah Şeyx Vəhid Xorasani “Baqirul-ulum mədrəsəsi”, Qum, 1421 h. q.*

20. ***«Tovzihul-məsail»** Ayətullah Seyyid Əli Sistani, “Məktəbətu Əhli-beyt”, Qum, 1415 h. q.*

21. ***«Məsaili-cədid əz dideqahe üləma və məraciye-təqlid»,** Seyyid Möhsin Mahmudi, Qum, 2004 m.*

22. ***«Vəsailuş-şiə»** Şeyx Həsən Hürr Amuli, “Müəssisətu alil-beyt”, Qum, 1414 h. q.*

23. ***«Tuhəful-uqul ən alir-Rəsul»** Şeyx Hərrani, “Aferənd” , Qum, 1427 h. q.*

24. ***«Mizanul-hikmət»** Muhəmməd Reyşəhri, “Darul-hədis”, Qum, 1375 h. ş.*

25. ***«Əl fiqhu ələl-məzahibil ərbəə»** Əbdürrəhman əl-Cəziri, “Darul-kutubil-elmiyyə”, Beyrut, 2003 miladi.*

26. ***«Məalimud-din və məlazul-müctehidin»** Şeyx Zeynud-din Amuli, “müəssisətu nəşri-islami” , Qum, 1417 h.q.*

27. ***«Fəraidul-usul»** Şeyx Ənsari, “Muəssisətu-mətbuati-dini”, Qum*

28. ***«Bolşoy arabsko-russkiy slovar»** X. K. Baranov , Moskva 2002*

29. ***«Jizn jivotnıx, rıbı»,*** *E.D.Vasilyeva*

30. ***«Bioloqiçeskiy slovar»*** *ensiklopediyası*

31. ***«Rasskaz o jizni rıb»*** *İ.F. Pravdin*

32. ***«Rıbı SSSR»*** *Lebedev V.D., Spanovskaya V.D., Savvaitova K.A., Sokolov L.İ., Çepkin E.A.*

# MÜNDƏRİCAT